

# YARADILIŞ SƏBƏBİ - TEVHİD





**De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür! (Əl-Ənam, 162)**

# *Mündəricat*

# XUTBƏTUL-HACƏ

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

*“Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün”. (Ali İmran 102)*

*“Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun. (Adı ilə) Bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir”. (ən-Nisa 1)*

*“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Əgər belə etsəniz) Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (Cənnətə) nail olar”. (əl-Əhzab 70-71)*

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd – sallallahu aleyhi və səlləm – in yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidət, hər

bir bidət isə zəlalətdir (sapıqlıqdır), hər bir (sapıqlıq) isə oddadır.

# Ön söz

Allah bütün insanları yalnız özünə ibadət etmələri üçün yaratmışdır. İbadətdən başqa bütün məsələlər isə insana Allaha ibadət etməyi asanlaşdırmaq üçün olan vasitələrdir. Lakin, günümüzdə insanlar bu həqiqətdən çox uzaqlaşmış, bütünlüklə Allahın axirəti qazanmaq üçün verdiyi bu müvəqqəti dünya həyatına meyl etmişlərdir. Bu səbəbdən insanlara bir xatırlatma olması üçün oxuduğunuz kitabı tərtib etmək qərarına gəldim. Bu kitabda ilk öncə dünya həyatının Allah qatında necə dəyərsiz olmasından, ölümün qaçınılmazlığından, qiyamət gününün dəhşətindən, cəhənnəm və cənnətdən bəhs edən Quran ayələri verilmiş, sonda isə bir insanın həqiqi müsəlman olub dünya və axirət səadətini qazanması üçün lazım olan inanc əsaslarından bəhs edilmişdir. Allahdan bu çalışmanın bərəkətli olmasını və bir çox insanın həqiqi islamı bilib Allaha doğru şəkildə ibadət etməsinə vəsilə olmasını diləyirəm.

# Dünya həyatı haqqında ayələr



## 3. Ali-İmran

14. Qadınların, uşaqların, yığın-yığın qızıl-gümüşün, yaxşı cins atların, malqaranın və əkin yerlərinin verdiyi zövqlərə olan istək insanların gözünə gözəl göstərilmişdir. Bunlar, **dünya həyatı**nın keçici zövqüdür, gözəl qayıdış yeri isə Allah yanındadır.

185. Hər bir kəs ölümü dadacaqdır. Lakin Qiyamət günü mükafatlarınız sizə tam veriləcəkdir. Kim Oddan uzaqlaşdırılıb, Cənnətə daxil edilərsə, o uğur qazanmış olar. **Dünya həyatı** isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.

## 6. əl-Ənam

31. Allah ilə qarşılaşmağı yalan sayanlar artıq ziyana uğramışlar. O Saat onları qəflətən haqladıqda onlar öz günah yüklərini bellərində daşıyaraq deyəcəklər: "Dünyada buraxdığımız əməllərə görə vay halımıza!" Onların daşıdıqları şey necə də pisdir!
32. **Dünya həyatı** oyun və əyləncədən başqa bir şey deyildir. Müttəqilər üçün isə axirət yurdu daha xeyirlidir. Məgər anlamırsınız?

130. Allah deyəcək: "Ey cin və insan tayfası! Məgər sizə öz içərinizdən ayələrimi xəbər verən və bu gününüzlə qarşılaşacağınız barədə sizə xəbərdarlıq edən elçilər gəlmədimi?" Onlar deyəcəklər: "Biz öz əleyhimizə şahidlik edirik!" Onları **dünya həyatı** aldatdı və onlar kafir olduqları barədə özlərinə qarşı şəhadət verdilər.

## 7. əl-Əraf

51. O kəslərə ki, dinlərini əyləncə və oyun etmişdilər və **dünya həyatı** onları aldatmışdı. Onlar bu günləri ilə qarşılaşmağı unutduqları və ayələrimizi inkar etdikləri kimi, Biz də onları bu gün unudarıq.

## 9. ət-Tovbə

38. Ey iman gətirənlər! Sizə nə olub ki, "Allah yolunda döyüşə çıxın!"– deyildikdə ağırlaşıb yerinizə çaxıldınız? Olmaya, axirətdən daha çox **dünya həyatı**ndan razısınız? Halbuki

**dünya həyatı**nın keçici zövqü axirətlə müqayisədə çox dəyərsiz bir şeydir.

## 10. Yunus

24. **Dünya həyatı**nın məsəli göydən endirdiyimiz suyun məsəlinə bənzəyir ki, onun sayəsində insanların və heyvanların yediyi yer bitkiləri bir-birinə qatışır. Nəhayət, yer öz bərbəzəyinə bürünüb rövnəqləndiyi və onun sakinləri ona (onun məhsulunu yığmağa) qadir olduqlarını güman etdikləri zaman gecə yaxud gündüz əmrimiz yerə yetişər. Biz onu, elə bir biçilmiş sahəyə döndərərik ki, sanki dünən heç bol məhsulu olmamışdı. Biz ayələri düşünən adamlar üçün beləcə izah edirik.

## 13. ər-Rad

26. Allah istədiyinin ruzisini bol edər, istədiyininkini də azaldar. Onlar **dünya həyatı** ilə sevinirlər. Halbuki **dünya həyatı** axirətlə müqayisədə keçici bir zövqdür.

## 18. əl-Kəhf

45. Onlara **dünya həyatı**nı misal çək. Bu **dünya həyatı** göydən göndərdiyimiz yağışa oxşar. Yerdəki bitkilər onunla qarışıb yetişər, sonra isə küləyin sovurub apardığı quru çör-çöpə dönər. Allah hər şeyə qadirdir.
46. Var-dövlət və övladlar **dünya həyatı**nın bərbəzəyidir. Əbədi qalan yaxşı əməllər isə Rəbbinin yanında savab və ümid baxımından daha əfzəldir.

## 28. əl-Qasas

60. Sizə verilən hər şey ancaq **dünya həyatı**nın keçici zövqü və onun bərbəzəyidir. Allah yanında olanlar isə daha xeyirli və daha sürəklidir. Məgər başa düşmürsünüz?
61. Məgər verdiyimiz gözəl bir vədə (Cənnətə) qovuşan kimsə, **dünya həyatı**nın keçici zövqünü bəxş etdiyimiz, sonra da qiyamət günü Cəhənnəmə gətiriləcək kimsə ilə eyni ola bilərmi?

## 29. əl-Ənkəbut

64. Bu **dünya həyatı** əyləncə və oyundan başqa bir şey deyildir. Axirət yurdu isə əsl həyatdır. Kaş ki, biləydilər!

## 30. ər-Rum

7. Onlar **dünya həyatı**nın görünən tərəfini bilir, axirətdən isə büsbütün qafildirlər.
8. Məgər onlar özlüyündə fikirləşmirlər ki, Allah göyləri, yeri və onların arasındakıları ancaq bir gerçəklik kimi və müəyyən müddət üçün yaratmışdır? Lakin, insanların çoxu Rəbbi ilə qarşılaşacağını inkar edir.

## 40. Ğafir

38. O mömin kişi dedi: "Ey qövmüm! Mənim ardımca gəlin, sizi doğru yola çıxardım.

39. Ey qövmüm! Bu **dünya həyatı** ancaq fani bir zövqdür, axirət isə qərar tutacağınız yurddur."

## 42. əş-Şura

36. Sizə verilən hər bir şey **dünya həyatı**nın keçici zövqüdür. Allahın yanında olanlar isə daha xeyirli və daha sürəklidir. Bunlar iman gətirib öz Rəbbinə təvəkkül edənlər üçündür.

## 43. əz-Zuxruf

35. ... Bütün bunlar sadəcə **dünya həyatı**nın keçici zövqüdür. Axirət isə sənin Rəbbinin yanında ancaq Allahdan qorxanlar üçündür.

## 47. Muhəmməd

36. Həqiqətən, **dünya həyatı** oyun və əyləncədən başqa bir şey deyildir. Əgər iman gətirib Allahdan qorxsanız, O sizə mükafatlarınızı verər və sizdən maldövlətinizi istəməz.

## 57. əl-Hədid

20. Bilin ki, **dünya həyatı** oyun və əyləncə, bəzək-düzək, bir-birinizin yanında öyünmək, var-dövləti və oğul-uşağı çoxaltmaq istəyindən ibarətdir. Bu elə bir yağışa bənzəyir ki, ondan əmələ gələn bitki əkinçiləri heyran edir. Sonra o quruyur və sən onun sapsarı olduğunu görürsən. Sonra isə o çör-çöpə dönür. Kimisini axirətdə şiddətli əzab, kimisini də

Allahdan bağışlanma və razılıq gözləyir. **Dünya həyatı** isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.

# Ölüm haqqında ayələr



**3. Ali-İmran surəsi**

154. ... De: "Əgər siz evlərinizdə olsaydınız belə, öldürülməsi qabaqcadan müəyyən edilmiş kimsələr yenə çıxıb öləcəkləri yerlərə gedərdilər. Allah sizin kökslərinizdə olanları sınamaq, qəlblərinizdə olanları təmizləmək üçün belə etdi. Allah kökslərdə olanları bilir".

185. Hər bir kəs ölümü dadacaqdır. Lakin Qiyamət günü mükafatlarınız sizə tam veriləcəkdir. Kim Oddan

uzaqlaşdırılıb, Cənnətə daxil edilərsə, o uğur qazanmış olar. **Dünya həyatı** isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.

## 4. ən-Nisa surəsi

18. Günah işlər görməkdə davam edənlərdən birinə ölüm gəldiyi zaman: "Mən indi tövbə etdim!"– deyənlərin də, kafir kimi ölənlərin də tövbəsi qəbul deyildir. Biz onlar üçün ağrılı-acılı bir əzab hazırlamışıq.

78. Harada olursunuzsa olun, ölüm sizi haqlayacaq. Hətta yüksək qalalarda olsanız belə. Onlara bir yaxşılıq üz verdikdə: "Bu, Allahdandır!"– deyər, bir pislik üz verdikdə isə: "Bu, səndəndir!"– deyərlər. De: "Hamısı Allahdandır!" Bu adamlara nə olub ki, az qala söz də anlamırlar?

## 6. əl-Ənam

60. Gecələr sizi yatızdıran, gündüzlər isə nələr etdiyinizi bilən Odur. Sonra O, sizi səhərlər oyadır ki, müəyyən olunmuş əcəliniz gəlib çatsın. Sonra isə dönüşünüz Ona olacaq. O, nə etdikləriniz barədə sizə xəbər verəcəkdir.

61. O Öz qulları üzərində mütləq hakimiyyət sahibidir. O sizə gözətçi mələklər göndərir. Nəhayət sizlərdən birinə ölüm gəldiyi zaman elçilərimiz (mələklər) onun canını alırlar və heç bir səhvə yol vermirlər.

62. Sonra onlar özlərinin həqiqi Himayədarı olan Allaha qaytarılacaqlar. Hökm yalnız Ona məxsusdur və O, ən tez haqq-hesab çəkəndir.

93. Allaha qarşı yalan uydurandan və ya özünə vəhy olunmadığı halda: "Mənə də vəhy olunmuşdur"– söyləyəndən və: "Mən də Allahın nazil etdiyinin bənzərini endirəcəyəm"– deyəndən daha zalım kim ola bilər? Zalımları ölüm girdabında olduqda, mələklərin də əllərini uzadıb: "Canlarınızı çıxarın! Allaha qarşı nahaq sözlər söylədiyinizə və Onun ayələrinə təkəbbür göstərdiyinizə görə bu gün siz cəzalandırılacaqsınız!"– dediklərini bircə görəydin.

## 7. əl-Əraf

37. Allaha qarşı yalan uyduran və ya Onun ayələrini yalan hesab edən kimsədən daha zalım kim ola bilər? Yazıda olan qismətləri onlara nəsib olacaqdır. Nəhayət, elçilərimiz onların canını almaq üçün yanlarına gəldikdə: "Allahdan savayı çağırdıqlarınız haradadır?"– deyəcəklər. Onlar: "Bizi qoyub qaçıblar!"– deyəcək və kafir olduqlarına dair öz əleyhlərinə şahidlik edəcəklər.

## 8. əl-Ənfal

50. Kaş sən kafirləri mələklər onların canını alarkən görəydin. Mələklər onların üzünə və yanlarına vura-vura deyirdilər: "Dadın yandırıcı odun əzabını!
51. Bu, öz əllərinizlə etdiyiniz əməllərə görədir. Yoxsa Allah qullarına zülm edən deyildir".

## 15. **əl-Hicr**

99. Sənə ölüm gələnədək Rəbbinə ibadət et.

## 16. ən-Nəhl

32. O kəslər ki, tər-təmiz olduqları halda, mələklər onların canını alıb deyirlər: "Sizə salam olsun! Əməllərinizə görə Cənnətə girin!"

## 21. əl-Ənbiya

34. Səndən əvvəl də heç bir bəşərə ölümsüzlük nəsib etmədik. Məgər sən öləcəksən, onlar həmişəlik qalacaqlar?!

35. Hər kəs ölümü dadacaqdır. Biz sizi sınamaq üçün şər və xeyirlə imtahana çəkirik. Siz ancaq Bizə qaytarılacaqsınız!

## 23. əl-Muminun

99. Nəhayət, onlardan birinə ölüm gəldiyi zaman deyər: "Ey Rəbbim! Məni geri qaytar.

## 32. əs-Səcdə

11. De: "Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaq, sonra da Rəbbinizə qaytarılacaqsınız!"

## 33. əl-Əhzab

16. De: "Əgər ölməkdən və ya öldürülməkdən qaçırsınızsa, bu qaçmaq qətiyyən sizə xeyir gətirməz. Belə olduğu təqdirdə siz ancaq əcəliniz çatana qədər çox az bir müddət ərzində gün-güzəran görəcəksiniz".

## 39. əz-Zumər

30. Heç şübhəsiz, sən də öləcəksən, onlar da öləcəklər!

42. Allah ölənlərin canını ölüm anında, ölməyənlərin canını isə onlar yuxuda ikən alır. Ölümünə hökm verdiyi kəsin canını saxlayır, digərini isə müəyyən olunmuş vaxtadək buraxır. Həqiqətən, bunda ağıl sahibləri üçün dəlillər vardır.

## 50. Qaf

19. Ölüm bihuşluğu həqiqətən gələcəkdir. Ey insan! Bu sənin uzaq qaçdığın şeydir.

## 62. əl-Cumuə

8. De: "Qaçdığınız ölüm sizi mütləq haqlayacaqdır. Sonra siz qeybi və aşkarı Bilənin hüzuruna qaytarılacaqsınız. O da sizə nə etdiklərinizi xəbər verəcəkdir".

## 63. əl-Munafiqun

10. Sizlərdən birinə ölüm gəlib: "Ey Rəbbim! Mənə bir az möhlət ver ki, sədəqə verib əməlisalehlərdən olum!"– deməmişdən əvvəl sizə verdiyim ruzidən xərcləyin.

## 74. əl-Muddəssir

43. Onlar deyəcəklər: "Biz namaz qılanlardan deyildik.
44. Kasıbı da yedizdirməzdik.
45. Batil sözlər danışanlarla birlikdə biz də danışardıq,
46. və Haqq-hesab gününü yalan hesab edərdik –
47. **ölüm yəqinliyi bizə gələnə qədər".**

# Diriliş haqqında ayələr (Qiyamət günü)



**2 əl-Bəqərə**

28. Allahı necə inkar edirsiniz ki, siz ölü idiniz, O sizi diriltdi? Sonra O sizi öldürəcək və yenə dirildəcək, daha sonra isə siz Ona qaytarılacaqsınız.

259. Və ya damları uçulub xarabalığa çevrilmiş bir kəndin yanından keçən kimsənin hekayətini bilmirsənmi? O demişdi: "Allah bu kəndi ölümündən sonra necə dirildəcək?" Allah onu öldürüb yüz il saxladı, sonra da dirildib dedi: "Nə qədər qaldın?" O dedi: "Bir gün yaxud bir gündən də az qaldım!"

Allah dedi: "Əksinə, sən yüz il qaldın. Öz yeməyinə və içdiyin suya bax, hələ də xarab olmayıb. Uzunqulağına da bax! Biz səni insanlar üçün bir dəlil etdik. Sümüklərə bax, gör Biz onları necə bir-birinə birləşdirir, sonra da onların üstünü ətlə örtürük". Ona həqiqət bəlli olduqda: "Mən artıq bilirəm ki, Allah hər şeyə qadirdir!"– dedi.

260. Bir zaman İbrahim: "Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!"– dedi. Rəbbi ona: "Məgər sən inanmırsan?"– dedi. İbrahim dedi: "Əlbəttə inanıram! Amma istəyirəm ki, qəlbim rahat olsun". Allah buyurdu: "Quşlardan dördünü tut və onları özünə tərəf çəkib tikə-tikə et. Sonra hər dağın başına onlardan bir parça qoy, sonra da onları çağır, tez sənin yanına gələcəklər. Bil ki, Allah Qüdrətlidir, Müdrikdir!"

## 6. əl-Ənam

27. Odun üzərində dayandırıldıqları vaxt onların: "Kaş ki, bizi dünyaya qaytaraydılar! Onda biz Rəbbimizin ayələrini yalan saymayıb möminlərdən olardıq"– dediklərini görəydin!
28. Xeyr! Əvvəllər gizlətdikləri günahlar onlara aşkar oldu. Əgər onlar geri qaytarılsaydılar, yenə də özlərinə qadağan olunmuş şeylərə qayıdardılar. Şübhəsiz ki, onlar yalançıdırlar.
29. Onlar dedilər: "**Dünya həyatı**mızdan başqa bir həyat yoxdur və biz dirildilməyəcəyik!"
30. Onları Rəbbinin qarşısında dayandırılarkən bircə görəydin! Allah deyəcəkdir: "Məgər bu dirilmə həqiqət deyilmi?" Onlar: "Əlbəttə, Rəbbimizə and olsun ki, bu həqiqətdir!"– deyəcəklər. O buyuracaqdır: "Elə isə inkar etdiyinizə görə dadın əzabı!"

36. Sənin çağırışını ancaq səmimi qəlbdən dinləyənlər qəbul edər. Ölülərə gəldikdə isə, Allah onları dirildəcək, sonra da onlar Onun hüzuruna qaytarılacaqlar.

## 7. əl-Əraf

14. İblis dedi: "Onların dirildiləcəyi günə qədər mənə möhlət ver".
15. Allah dedi: "Şübhəsiz ki, sən möhlət verilənlərdənsən".
16. İblis dedi: "Sən məni yoldan çıxartdığına görə mən də Sənin düz yolunun üstündə oturub insanları tovlayacağam.
17. Sonra onların yanına önlərindən və arxalarından, sağlarından və
sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən".

29. De: "Rəbbim ədalətli olmağı əmr etdi. Hər səcdə etdiyiniz yerdə üzünüzü Ona tutun və Allaha – dini məhz Ona məxsus edərək dua edin. Sizi ilk dəfə yaratdığı kimi diriləcəksiniz".

57. Küləkləri Öz mərhəməti önündə yağışdan qabaq müjdəçi olaraq göndərən Odur. Nəhayət, o küləklər ağır buludları daşıyarkən, Biz o buludları ölü bir diyara tərəf qovur, onunla yağmur endirir və bunun vasitəsi ilə hər cür meyvə yetişdiririk. Biz ölüləri də belə dirildəcəyik. Bəlkə, düşünüb ibrət alasınız.

## 10. Yunus

4. Hamınızın dönüşü Onadır. Bu, Allahın haqq olan vədidir. O, məxluqu ilk dəfə yaradır, sonra onu Qiyamət günü yenidən dirildir ki, saleh əməllər edənləri ədalətlə mükafatlandırsın. Kafirlərə gəlincə, küfr etdiklərinə görə onlar üçün qaynar içki və ağrılı-acılı bir əzab hazırlanmışdır.

55. Bilin ki, göylərdə və yerdə olanların hamısı Allahındır. Bilin ki, Allahın vədi haqdır, lakin onların çoxu bunu bilmir.
56. O, həm dirildir, həm də öldürür. Siz yalnız Ona qaytarılacaqsınız.

## 11. Hud

7. Hansınızın daha yaxşı əməl sahibi olduğunu sınamaq üçün, Ərşi su üzərində ikən, göyləri və yeri altı gündə yaradan Odur. Əgər sən: "Siz öləndən sonra diriləcəksiniz!"– desən, kafir olanlar: "Bu, açıq-aydın bir sehrdir!"– deyərlər.
8. Əgər onlara gələcək əzabı müəyyən vaxtadək gecikdirsək: "Onu saxlayan nədir?"– deyəcəklər. Xəbəriniz olsun ki, əzab onlara gəldiyi gün onu heç nə onlardan dəf edə bilməyəcək və istehza etdikləri o əzab onları bürüyəcəkdir.

## 15. əl-Hicr

23. Şübhəsiz ki, Biz həm dirildir, həm də öldürürük və hər şeyə varis olan da Bizik.

36. İblis dedi: "Ey Rəbbim! Onların dirildiləcəkləri günə qədər mənə möhlət ver".
37. Allah dedi: "Sən möhlət verilənlərdənsən.
38. Ancaq məlum vaxtın gününə qədər".

39. İblis dedi: "Ey Rəbbim! Sən məni yoldan çıxartdığına görə, mən də yer üzündə onlara pis işləri gözəl göstərib onların hamısını azdıracağam.
40. Yalnız Sənin seçilmiş, ixlaslı qullarından başqa".

## 16. ən-Nəhl

20. Allahdan başqa tapındıqları bütlər heç bir şey yarada bilməzlər. Çünki onlar özləri yaradılmışlar.
21. Onlar ölüdürlər – diri deyillər və nə vaxt dirildiləcəklərini də bilmirlər.
22. Sizin məbudunuz Tək olan İlahdır. Axirətə inanmayanların qəlbi haqqı inkar edir. Özləri də təkəbbürlüdürlər.

38. Onlar Allaha möhkəm and içdilər ki: "Allah ölən bir kəsi diriltməyəcəkdir!" Xeyr! Allahın ölüləri diriltməsi Onun doğru vədinə görə olacaq, lakin insanların çoxu bunu bilmirlər.
39. Allah ölüləri dirildəcəkdir ki, ixtilafda olduqları şeyləri onlara bildirsin və kafirlər də özlərinin yalançı olduqlarını dərk etsinlər.
40. Biz bir şeyi yaratmaq istədikdə, ona ancaq: "Ol!"– deyirik, o da olur.

## 17. əl-İsra

49. Onlar deyirlər: "Biz sür-sümük və toz halına düşdüyümüz zaman yeni bir məxluq kimi dirildiləcəyikmi?"

50. De: "İstər daş olun, istər dəmir,
51. və ya sizə nəhəng görünən bir məxluq olun, yenə də Allah sizi diriltməyə qadirdir". Onlar deyəcəklər: "Bizi həyata kim qaytaracaq?" De: "İlk dəfə siziyaradan!" Onlar istehza ilə başlarını yırğalayıb: "Bəs bu nə vaxt olacaqdır?"– deyəcəklər. De: "Bəlkə də, yaxın zamanda oldu!"

98. Bu, ayələrimizi inkar etdiklərinə və: "Məgər biz sür-sümük və ovuntu olduğumuz halda yeni bir məxluq olaraq dirildiləcəyik?"– dediklərinə görə onların cəzasıdır.
99. Məgər onlar görmürlər ki, göyləri və yeri yaradan Allah onlar kimisini də yaratmağa qadirdir? Allah onlar üçün elə bir əcəl müəyyən etmişdir ki, ona heç bir şəkk-şübhə yoxdur. Zalımlar isə küfrdən başqa bir şey qəbul etmədilər.

## 19. Məryəm

12. Yəhyaya da: "Ey Yəhya! Kitabdan möhkəm yapış!"– deyə vəhy etdik. Biz ona uşaq ikən hikmət bəxş etik.
13. Üstəlik Öz tərəfimizdən bir şəfqət və paklıq da bəxş etdik. O, müttəqi idi.
14. Həm də ata-anasına qarşı qayğıkeş idi; lovğa və asi deyildi.
15. Doğulduğu gün də, öləcəyi gün də, **yenidən dirildiləcəyi gün də** ona salam olsun!

## 22. əl-Həcc

5. Ey insanlar! Yenidən diriləcəyinizə şübhə edirsinizsə, bilin ki, həqiqətən də, Biz sizi torpaqdan, sonra nütfədən, sonra

laxtalanmış qandan, daha sonra tam bir şəklə salınmış və ya salınmamış bir parça ətdən yaratdıq ki, qüdrətimizi sizə bəyan edək. Bətnlərdə istədiyimizi müəyyən bir vaxt ərzində saxlayırıq. Sonra sizi oradan uşaq kimi çıxardırıq ki, yetkinlik çağına yetişəsiniz. Sizdən kimisi yetkinlik yaşına çatmamış vəfat edir, kimisi də ömrünün ən rəzalətli dövrünə çatdırılır ki, vaxtilə bildiyi şeyləri unutsun. Sən yer üzünü cansız görürsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə gəlib qabarır və cürbəcür gözəl bitkilər bitirir.
6. Bunun səbəbi Allahın Haqq olmasındadır. O, ölüləri diriltdir və hər şeyə qadirdir,
7. Həmin Saat gələcəkdir, ona heç bir şəkk-şübhə yoxdur və Allah qəbirlərdə olanları dirildəcəkdir.

66. Sizə həyat verən, sonra öldürəcək, daha sonra dirildəcək məhz Odur. İnsan, həqiqətən də, nankordur.

## 23. əl-Muminun

14. Sonra nütfədən laxtalanmış qan yaratdıq, sonra o qandan bir parça ət yaratdıq, sonra o bir parça ətdən sümüklər yaratdıq, sonra da sümükləri ət ilə örtdük. Sonra da onu başqa bir məxluq olaraq xəlq etdik. Yaradanların ən yaxşısı olan Allah nə qədər xeyirxahdır!
15. Şübhəsiz ki, bundan sonra siz mütləq öləcəksiniz.
16. **Sonra da Qiyamət günü dirildiləcəksiniz.**

82. Onlar (kafirlər) dedilər: "Məgər biz ölüb torpaq və sür-sümük olduqdan sonra dirildiləcəyik?"

83. Bu dirilmə həm bizə, həm də əvvəllər atalarımıza vəd olunmuşdu. Bu, keçmişdəkilərin əfsanələrindən başqa bir şey deyil.

99. Nəhayət, onlardan birinə ölüm gəldiyi zaman deyər: "Ey Rəbbim! Məni geri qaytar.
100. Bəlkə, tərk etdiyim yaxşı əməlləri indi edəm". Xeyr! Onun bu dedikləri ancaq boş bir sözdür. Onların arxasında diriləcəkləri günə qədər bərzəx vardır.

## 25. əl-Furqan

22. Məhz mələkləri görəcəkləri gün günahkarlara heç bir müjdə olmayacaqdır. Mələklər deyəcəklər: "Cənnətə girməyiniz qadağandır, qadağan!"
23. Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik.
24. Həmin gün Cənnət sakinlərinin qalacağı yer daha lətafətli və istirahət edəcəyi yer daha gözəl olacaqdır.
25. Həmin gün göy buludla parçalanacaq və mələklər yerə endiriləcəkdir.
26. Həmin gün gerçək hökm vermək ancaq ər-Rəhmana məxsusdur. O, kafirlər üçün çətin bir gün olacaqdır.

40. Məkkə müşrikləri bəla yağmuru düşüb viran qalmış şəhərin yanından keçmişdilər. Məgər onlar onu

görməmişdilər? Xeyr, onlar öldükdən sonra dirilməyə də inanmırlar.

## 26. əş-Şuəra

78. O Rəbb ki, məni yaratmış və məni doğru yola yönəltmişdir;
79. O Rəbb ki, məni yedirdir və içirdir;
80. O Rəbb ki, xəstələndiyim zaman mənə şəfa verir;
**81. O Rəbb ki, məni öldürəcək, sonra dirildəcəkdir;**
82. O Rəbb ki, Haqq-hesab günü xətalarımı bağışlayacağını Ondan umuram.

**87. Onların dirildiləcəyi gün məni rüsvay etmə!**
88. O gün ki, nə var-dövlət, nə də oğul-uşaq bir fayda verməyəcək.
89. Ancaq sağlam bir qəlblə Allahın hüzuruna gələnlərdən başqa!

## 27. ən-Nəml

64. Məxluqatı əvvəldən yaradan, sonra onu yenidən dirildən, sizə göydən və yerdən ruzi verən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var?" De: "Əgər doğru deyirsinizsə, dəlilinizi gətirin".

65. De: "Allahdan başqa göylərdə və yerdə olanların heç biri qeybi bilməz. Onlar nə zaman diriləcəklərini belə bilmirlər.

66. Həm də onların elmi axirəti qavrayıb dərk edə bilməz. Üstəlik də onun barəsində şəkk-şübhə içindədirlər, hətta ona qarşı kor kimi baxarlar".
67. Kafirlər dedilər: "Məgər biz və atalarımız torpağa qarışdıqdan sonra qəbirlərdən çıxardılacağıq?
68. Bu dirilmə həm bizə, həm də əvvəllər atalarımıza vəd olunmuşdu. Bu, keçmişdəkilərin uydurduğu əfsanələrindən başqa bir şey deyildir".

## 29. əl-Ənkəbut

20. De: "Yer üzünü gəzib dolaşın və Allahın məxluqatı ilk dəfə necə yaratdığına baxın. Sonra Allah ölüləri diriləcəkdir. Allah hər şeyə qadirdir.
21. O, istədiyinə əzab verir, istədiyinə də rəhm edir. Siz yalnız Ona qaytarılacaqsınız.
22. Siz nə yerdə, nə də göydə Ondan gizlənib yaxa qurtara bilməyəcəksiniz. Allahdan başqa sizin nə bir himayədarınız, nə də bir yardımçınız olacaq".

## 30. ər-Rum

19. O, ölüdən diri, diridən də ölü çıxardır; yeri ölümündən sonra dirildir. Siz də qəbirlərinizdən belə dirildilib çıxardılacaqsınız.

40. Sizi yaradan, sonra sizə ruzi verən, sonra sizi öldürən, sonra da sizi dirildəcək məhz Allahdır. Şərikləriniz içərisində bunlardan, heç olmazsa, birini edə bilən varmı? O, pakdır və müşriklərin Ona şərik qoşduqlarından ucadır.

50. Sən Allahın mərhəmətinin izlərinə bax ki, yeri öldükdən sonra necə dirildir. Şübhəsiz ki, O, ölüləri də mütləq dirildəcəkdir. O, hər şeyə qadirdir.

55. O Saatın gəldiyi gün günahkarlar dünyada bircə saat qaldıqlarına and içəcəklər. Onlar dünyada da haqdan belə üz döndərirdilər.
56. Bilik və iman nəsib edilmiş kimsələr isə deyəcəklər: "Siz orada Allahın yazısı ilə Dirilmə gününə qədər qaldınız. Bu gün, məhz Dirilmə günüdür, lakin siz bunu bilmirdiniz".
57. Həmin gün zalımlara bəhanələri fayda verməyəcək və onlardan tövbə etmələri tələb olunmayacaqdır.

## 35. Fatir

9. Buludları hərəkətə gətirən küləkləri göndərən Allahdır. Biz onları ölü bir diyara tərəf qovub, yeri ölümündən sonra onunla canlandırırıq. Diriltmə də belə olacaqdır.

## 36. Ya sin

12. Həqiqətən, ölüləri dirildən, onların bu dünyada törətdiklərini və tərk etdiklərini yazan Bizik. Biz hər şeyi açıq-aydın Yazıda (Lövhi-məhfuzda) qeydə almışıq.

78. O Bizə bir məsəl çəkdi, lakin yaradılışını unutdu. O dedi: "Çürümüş sümükləri kim dirildə bilər?"
79. De: "Onları ilk dəfə yaradan Özü onları dirildəcəkdir. O, hər bir məxluquna yaxşı bələddir.

80. O sizin üçün yaşıl ağacdan od əmələ gətirdi. Budur, siz indi ondan od yandırırsınız".
81. Göyləri və yeri yaradan onların eynisini yenidən xəlq etmək qüdrətinə malik olmazmı?! Şübhəsiz ki, O, Yaradandır, Biləndir.
82. Bir şeyi yaratmaq istədikdə ona təkcə: "Ol!" deyər, o da olar.

## 37. əs-Saffat

16. Məgər biz öldükdən, sür-sümük olub torpağa çevrildikdən sonra dirildiləcəyikmi?
17. Ya da atalarımızmı dirildiləcəklər?"
18. De: "Bəli, özü də, zəlil günə qalmış olduğunuz halda dirildiləcəksiniz".
19. Bu, təkcə dəhşətli bir səs olacaq və onlar qəfildən dirilib görməyə başlayacaqlar.
20. Günahkarlar deyəcəklər: "Vay halımıza! Bu ki, Haqq-hesab günüdür!"
21. Onlara deyiləcək: "Bu, yalan saydığınız Fərqləndirmə günüdür!"

## 38. Sad

75. Allah dedi: "Ey İblis! Sənə Mənim iki əlimlə yaratdığıma səcdə etməyə mane olan nə idi? Təkəbbür göstərdin, böyüklərdənmi olmuşdun?"
76. İblis dedi: "Mən ondan daha xeyirliyəm. Çünki Sən məni oddan, onu isə palçıqdan yaratdın!"
77. Allah dedi: "Çıx oradan! Sən artıq rəhmətimdən qovulmuşsan!

78. Haqq-hesab gününə qədər lənətim sənin üzərində olacaqdır!"
79. İblis dedi: "Ey Rəbbim! Onlar dirildiləcəkləri günə qədər mənə möhlət ver".
80. Allah dedi: "Sən möhlət verilənlərdənsən –
81. vaxtı məlum olan günə qədər!"
82. İblis dedi: "Sənin qüdrətinə and olsun ki, onların hamısını yoldan çıxaracağam;
83. Təkcə Sənin seçilmiş ixlaslı qullarından başqa!"

## 40. Ğafir

11. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Sən bizi iki dəfə öldürüb, iki dəfə diriltdin. Biz öz günahlarımızı etiraf etdik. Oddan çıxmağa bir yol varmı?"
12. Onlara deyiləcək: "Bu ona görədir ki, bir olan Allah çağırıldığı zaman siz inkar edirdiniz. Ona şərik qoşulduqda isə inanırdınız. Artıq hökm Uca və Böyük Allahındır".

68. Dirildən də, Öldürən də Odur. O, bir şeyin olmasını istədikdə ona ancaq: "Ol"– deyir, o da olur.

## 41. Fussilət

39. Yer üzünü qupquru görməyin də Onun dəlillərindəndir. Biz yerin üzərinə su endirdikdə o, hərəkətə gəlib qabarır. Şübhəsiz ki, onu dirildən, ölüləri də hökmən dirildəcəkdir. Həqiqətən, O, hər şeyə qadirdir.

## 42. əş-Şura

9. Onlar özlərinə Allahdan başqa himayəçilər götürdülər. Hərçənd ki, Himayədar ancaq Allahdır. O, ölüləri dirildir. O, hər şeyə qadirdir.

## 43. əz-Zuxruf

11. Göydən lazım olduğu qədər su endirildi. Biz onunla ölü bir diyarı diriltdik. Siz də beləcə dirildilib çıxarılacaqsınız.

## 44. əd-Duxan

8. Ondan başqa ibadətə layiq olan məbud yoxdur. O həm dirildir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də əcdadlarınızın Rəbbidir.

34. Bunlar (kafirlər) mütləq deyəcəklər:
35. "Bizim ancaq bircə ölümümüz var. Biz bir daha dirildilməyəcəyik.
36. Əgər doğru deyirsinizsə, onda atalarımızı dirildib gətirin!"
37. Bunlar yaxşıdır, yoxsa Tubba tayfası və onlardan əvvəlkilər? Biz onları məhv etdik. Çünki onlar günahkar adamlar idi.
38. Biz göyü, yeri və onların arasında olanları əyləncə üçün və əbəs yerə yaratmadıq.

## 45. əl-Casiyə

25. Bizim aydın ayələrimiz onlara oxunduğu zaman onların dəlili: "Əgər doğru deyirsinizsə, atalarımızı dirildib gətirin!"– deməkdən başqa bir şey deyildir.
26. De: "Allah sizə həyat verir, sonra öldürür, sonra da sizi gələcəyinə heç bir şəkk-şübhə olmayan Qiyamət günü dirildib bir yerə toplayacaqdır". Lakin insanların çoxu bunu bilmir

## 46. əl-Əhqaf

33. Məgər onlar göyləri və yeri yaradan, onları yaratmaqla yorulmayan Allahın ölüləri də diriltməyə qadir olduğunu görmürlərmi? Sözsüz ki, O, hər şeyə qadirdir.
34. Kafirlər Odun qarşısına gətiriləcəkləri gün onlara: "Məgər bu, həqiqət deyilmi?"– deyiləcəkdir. Onlar: "Bəli, Rəbbimizə and olsun ki, həqiqətdir!"– deyəcəklər. Allah da: "Küfr etdiyinizə görə dadın əzabı!"– deyəcəkdir.

## 50. Qaf

2. Onlara öz aralarından xəbərdarlıq edən bir peyğəmbər gəlməsinə təəccüb edən kafirlər dedilər: "Bu çox qəribə bir şeydir.
3. Məgər biz ölüb torpağa qarışdıqdan sonra yenidən diriləcəyik? Bu, əlçatmaz bir qayıdışdır!"

9. Biz göydən bərəkətli su endirdik, onunla bağlar və biçilən taxıl dənələri bitirdik.
10. Eləcə də meyvələri salxım-salxım asılmış hündür xurma ağacları bitirdik.

11. Qullara ruzi olsun deyə belə etdik! Biz onunla ölü bir məmləkəti diriltdik. Dirilib qəbirdən çıxmaq da belədir.

15. Məgər Biz ilk yaradılışdan zəiflədikmi? Xeyr! Onlar yeni yaradılış olan dirilmə barəsində şübhə içindədirlər.
16. İnsanı Biz yaratdıq və nəfsinin ona nəyi vəsvəsə etdiyini də bilirik. Biz ona şah damarından da yaxınıq.

43. Şübhəsiz ki, dirildən də, öldürən də Bizik. Dönüş də yalnız Bizədir.
44. O gün yer onlardan ötrü yarılacaq, onlar sürətlə carçıya doğru çıxacaqlar. Beləcə, onları bir yerə yığmaq Bizim üçün asandır.

## 53. ən-Nəcm

44. Öldürən də, dirildən də Odur!
45. O, insanlardan və heyvanlardan biri erkək və bir də dişi olmaqla iki cüt yaratdı –
46. axıdılan bir nütfədən.
47. Təkrar diriltmək də Ona aiddir.

## 56. əl-Vaqiə

45. Onlar bundan əvvəl cah-calal içində idilər,
46. böyük günah işlətməkdə israr edirdilər
47. və deyirdilər: "Məgər biz ölüb torpaq və sür-sümük olduqdan sonra yenidənmi dirildiləcəyik?

48. Yaxud bizim əcdadlarımız dirildiləcəklərmi?"
49. De: "Şübhəsiz ki, əvvəlkilər də, sonrakılar da,
50. bəlli bir günün müəyyən vaxtında mütləq toplanılacaqlar.”

57. Sizi Biz yaratdıq. Bəs nə üçün dirildiləcəyinizi təsdiq etmirsiniz?
58. Axıtdığınız nütfəni gördünüzmü?
59. Onu siz yaradırsınız, yoxsa Biz?
60. Sizin aranızda ölümü Biz müəyyən etdik və heç nə Bizim qarşımızı ala bilməz.
61. Sizi bənzərləriniz ilə əvəz etməyə və sizi özünüz bilmədiyiniz başqa bir şəkildə yaratmağa Bizə mane olan tapılmaz.
62. Siz ilk yaradılışı bilirsiniz. Bəs nə üçün dirildiləcəyiniz barədə düşünmürsünüz?
63. Əkdiyinizi gördünüzmü?
64. Onu siz bitirirsiniz, yoxsa Biz bitiririk?

## 57. əl-Hədid

2. Göylərin və yerin hökmranlığı Ona məxsusdur. O həm dirildir, həm də öldürür. O, hər şeyə qadirdir.

## 58. əl-Mucadilə

18. Allah onların hamısını dirildəcəyi gün onlar sizə and içdikləri kimi, Ona da and içəcək və nə isə əldə etdiklərini güman edəcəklər. Əslində, onlar əsl yalançılardır.

19. Şeytan onları üstələmiş və Allahı zikr etməyi onlara unutdurmuşdur. Onlar şeytanın firqəsindəndirlər. Şübhə yoxdur ki, şeytanın firqəsindəkilər ziyana uğrayanlardır.

## 60. əl-Mumtəhənə

13. Ey iman gətirənlər! Allahın qəzəbinə gəlmiş adamlarla dostluq etməyin. Kafirlər qəbirdəkilərin bir daha diriləcəyinə inanmadıqları kimi Axirət gününə də ümid etmirlər.

## 64. əl-Təğabun

7. Kafir olanlar heç vaxt dirildilməyəcəklərini iddia edirlər. De: "Xeyr, Rəbbimə and olsun ki, siz mütləq dirildiləcəksiniz. Sonra isə etdiyiniz əməllər sizə xəbər veriləcəkdir. Bu, Allah üçün çox asandır!"

## 72. əl-Cinn

6. Həqiqətəna, insanlardan bəziləri cinlərin bəzilərinə sığınırdılar. Bu isə onların azğınlığını artırırdı.
7. Onlar da siz zənn etdiyiniz kimi, elə düşünürdülər ki, Allah ölənləri diriltməyəcəkdir.
8. Biz səmaya qalxdıqda onun sərt gözətçilər və yandırıb-yaxan alovlarla dolu olduğunun şahidi olduq.
9. Biz əvvəllər gizlicə qulaq asmaq üçün göyün bəzi sahələrində otururardıq. Amma kim bunu indi etmək istəsə, o, pusquda gözləyən yandırıcı alova rast gələr.

## 75. əl-Qiyamə

36. Bəlkə insan özbaşına qoyulacağını güman edir?
37. Məgər o, kişi toxumundan axıdılan bir damla nütfə deyildimi?
38. Sonra laxtalanmış qan oldu. Allah onu yaradıb kamil bir görkəmə saldı.
39. Ondan da bir cüt kişi və qadın yaratdı.
40. Məgər O, ölüləri diriltməyə qadir deyil?

## 80. Əbəsəs

18. Qoy baxıb görsün Allah onu nədən yaradıb?
19. Allah onu nütfədən yaratdı və müəyyən şəkildə formalaşdırdı.
20. Sonra da onun yolunu asanlaşdırdı.
21. Sonra onu öldürüb qəbirə yerləşdirdi.
22. İstədiyi bir zaman onu dirildəcəkdir.

## 83. əl-Mutaffifin

4. Onlar dirildiləcəklərini fikirləşmirlərmi?
5. Həm də əzəmətli bir gündə.
6. O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar.

## 86. ət-Tariq

5. Qoy insan nədən yaradıldığına bir baxsın!
6. O, süzülüb tökülən bir mayedən yaradılmışdır.
7. Bu maye bel və köks sümükləri arasından çıxır.
8. Şübhəsiz ki, Allah onu dirildib qaytarmağa qadirdir.

# Cəhənnəm haqqında ayələr



**2 əl-Bəqərə**

6. Həqiqətən, kafirləri qorxutsan da, qorxutmasan da, onlar üçün fərqi yoxdur, iman gətirməzlər.
7. Allah onların qəlblərini və qulaqlarını möhürləmiş, gözlərinə də pərdə çəkmişdir Onlar üçün böyük bir əzab vardır.
8. İnsanlar arasında elələri də vardır ki, mömin olmadıqları halda: "Allaha və Axirət gününə inanırıq"– deyirlər.
9. Onlar Allahı və iman gətirənləri aldatmağa çalışırlar Halbuki yalnız özlərini aldadır və bunu anlamırlar.

10. Onların qəlblərində xəstəlik vardır və Allah da onların xəstəliyini artırmışdır Yalan söylədiklərinə görə də ağrılı-acılı bir əzab çəkəcəklər.

80. Onlar dedilər: "Od bizə ancaq bir neçə gün toxunacaq!" De: "Məgər siz Allahdan əhd almışsınızmı? Allah verdiyi əhdə əsla xilaf çıxmaz! Yoxsa Allaha qarşı bilmədiyinizi danışırsınız?"
81. Xeyr! Günah qazanan və xətaları özlərini bürüyən kimsələr – məhz onlar Od sakinləridir və orada əbədi qalacaqlar!

166. O zaman, tabe olunmuş başçılar tabe olunanlardan uzaqlaşacaq, hamısı
əzabı görəcək və aralarındakı əlaqələr kəsiləcəkdir.
167. Tabe olanlar deyəcəklər: "Əgər bizim üçün dünyaya dönüş olsaydı, indi onlar bizdən uzaqlaşdıqları kimi biz də onlardan uzaqlaşardıq!" Beləcə, peşman olsunlar deyə Allah onlara özlərinin əməllərini göstərəcək və onlar heç vaxt Cəhənnəm odundan çıxa bilməyəcəklər.
175. Onlar doğru yolun əvəzinə azğınlığı, bağışlanmanın isə əvəzinə əzabı satın alan şəxslərdir. Onlar Cəhənnəm oduna necə də səbirlidirlər!
206. Ona: "Allahdan qorx!"– deyildikdə, lovğalıq onu daha da günaha sürükləyər. Ona Cəhənnəm kifayət edər. Ora nə pis yataqdır!

## 3. Ali-İmran

10. Kafir olanların nə malları, nə də övladları onlara Allahın hüzurunda heç bir şeylə fayda verə bilməz. Onlar Cəhənnəmin yanacağıdırlar.
11. Onların əməli Firon nəslinin və onlardan əvvəlkilərin əməlinə bənzəyir. Onlar Bizim ayələrimizi yalan hesab etdilər, Allah da onları günahlarına görə yaxaladı. Allah şiddətli cəza verəndir.
12. Kafirlərə de: "Siz məğlub olacaq və Cəhənnəmə toplanılacaqsınız! Ora nə pis yataqdır!"

162. Məgər Allahın razılığını qazanmaq üçün gedən kimsə, Allahın qəzəbinə gələn və sığınacaq yeri Cəhənnəm olan bir kimsə ilə bərabər tutula bilərmi? Ora nə pis qayıdış yeridir!

196. Qoy kafirlərin diyarbədiyar gəzib dolaşması səni aldatmasın!
197. Bu, az bir mənfəətdir. Sonra isə onların yeri Cəhənnəmdir. Ora nə pis yataqdır!

## 4. ən-Nisa

14.Kim Allaha və Onun Elçisinə asi olub Onun hüdudlarını aşarsa, Allah onu içində əbədi qalacağı Cəhənnəm oduna vasil edər. Onun üçün alçaldıcı bir əzab vardır.

55. Onlardan kimi Muhəmmədə iman gətirdi, kimi də ondan üz çevirdi. Yandırıb-yaxan od kimi Cəhənnəm onlara bəsdir.
56. Şübhəsiz ki, ayələrimizi inkar edənləri odda yandıracağıq. Hər dəfə onların dəriləri yandıqca, əzabı daim dadsınlar deyə,

Biz o dəriləri başqa dərilərlə əvəz edəcəyik. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir.

93. Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası içərisində əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəblənər, onu lənətləyər və onun üçün böyük bir əzab hazırlayar.

118. Allah şeytana lənət etdi. O isə dedi: "Mən Sənin qullarından müəyyən bir qismini hökmən ələ alacağam.
119. Mən onları mütləq doğru yoldan azdıracaq və xülyalara salacağam; onlara mal-qaranın qulaqlarını kəsməyi buyuracaq və Allahın yaratdıqlarına dəyişiklik verməyi əmr edəcəyəm". Allahı qoyub şeytanı özünə himayədar tutan şəxs açıq-aşkar ziyana uğramışdır.
120. Şeytan onlara vədlər verir və onları xülyalara salır. Lakin şeytanın onlara verdiyi vədlər aldatmaqdan başqa bir şey deyildir.
121. Onların sığınacaqları yer Cəhənnəmdir. Onlar oradan xilas olmağa bir yol tapa bilməzlər.

140. Allah Kitabda sizə nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman, günahkarlar başqa bir söhbətə keçməyincə onlarla bir yerdə oturmayın. Yoxsa siz də onların tayı olarsınız. Şübhəsiz ki, Allah bütün münafiqləri və kafirləri Cəhənnəmə toplayacaqdır.

168. Kafirləri və zalımları Allah bağışlamayacaq və doğru yola yönəltməyəcəkdir;
169. içərisində əbədi qalacaqları Cəhənnəm yolundan başqa. Bu isə Allah üçün asandır.

## 5. əl-Maidə

9. Allah iman gətirib saleh əməllər edənlərə vəd etmişdir ki, onlar üçün bağışlanma və böyük mükafat vardır.
10. Kafir olub ayələrimizi yalan sayanlar isə Cəhənnəm sakinləridirlər.

## 7. əl-Əraf

11. Sizi xəlq etdik, sonra sizə surət verdik, sonra da mələklərə: "Adəmə səcdə edin!"– dedik. İblisdən başqa hamısı səcdə etdi. O, səcdə edənlərdən olmadı.
12. Allah dedi: "Mən sənə əmr etdikdə sənə səcdə etməyə nə mane oldu?" İblis dedi: "Mən ondan daha üstünəm. Çünki Sən məni oddan, onu isə palçıqdan yaratmısan!"
13. Allah dedi: "Buradan aşağı en! Burada təkəbbürlük göstərmək sənə yaramaz. Çıx get, çünki sən alçaldılmışlardansan".
14. İblis dedi: "Onların dirildiləcəyi günə qədər mənə möhlət ver".
15. Allah dedi: "Şübhəsiz ki, sən möhlət verilənlərdənsən".
16. İblis dedi: "Sən məni yoldan çıxartdığına görə mən də Sənin düz yolunun üstündə oturub insanları tovlayacağam.
17. Sonra onların yanına önlərindən və arxalarından, sağlarından və sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən".
18. Allah buyurdu: "Oradan mənfur və qovulmuş halda çıx! Onlardan hər kəs sənin ardınca getsə, əlbəttə, Cəhənnəmi sizin hamınızla dolduracağam.

40. Şübhəsiz ki, ayələrimizi yalan sayanlara və onlara təkəbbürlüklə yanaşanlara göyün qapıları açılmayacaq və dəvə iynənin gözündən keçməyincə onlar Cənnətə girməyəcəklər. Biz günahkarları belə cəzalandırırıq.
41. Onların Cəhənnəm odundan yatağı və yorğanları olacaqdır. Biz zalımları belə cəzalandırırıq.

50. Od sakinləri Cənnət əhlini səsləyib deyəcəklər: "Bizim üstümüzə bir az su və ya Allahın sizə verdiyi ruzidən tökün". Onlar isə deyəcəklər: "Allah bunları kafirlərə haram etmişdir".
51. O kəslərə ki, dinlərini əyləncə və oyun etmişdilər və **dünya həyatı** onları aldatmışdı. Onlar bu günləri ilə qarşılaşmağı unutduqları və ayələrimizi inkar etdikləri kimi, Biz də onları bu gün unudarıq.

179. Biz Cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq. Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər. Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar. Qafil olanlar da məhz onlardır.

## 8. əl-Ənfal

13. Bu, onların Allaha və Onun Elçisinə qarşı çıxmalarına görədir. Allaha və Onun Elçisinə qarşı çıxan kimsəyə Allah şiddətli əzab verər.
14. Bax belə! İndi dadın onu! Kafirlər üçün Cəhənnəm odunun əzabı da hazırlanmışdır.

36. Şübhəsiz ki, kafir olanlar insanları Allah yolundan sapdırmaq üçün öz mallarını sərf edirlər. Onlar onu sərf edəcək, sonra bunun peşmançılığını çəkəcək, daha sonra isə məğlub ediləcəklər. Kafir olanları Cəhənnəmə toplayacaqlar ki,
37. Allah murdarı pakdan ayırsın, murdarları bir-birinin üstünə qoyub bir yerə yığsın və onları Cəhənnəmdə yerləşdirsin. Ziyana uğrayanlar da məhz onlardır.

## 9. ət-Tovbə

34. ... Qızıl-gümüş yığıb onları Allah yolunda sərf etməyənləri ağrılı-acılı bir əzabla müjdələ.
35. O gün bu yığdıqları sərvətlər Cəhənnəm odunda qızdırılacaq və bununla onların alınlarına, böyürlərinə və kürəklərinə damğa vurulacaq və onlara: "Budur özünüz üçün yığdıqlarınız. Elə isə dadın yığdıqlarınızı!"– deyiləcəkdir.

63. Məgər bilmirdilərmi ki, Allaha və Onun Elçisinə qarşı çıxanlar üçün içində əbədi qalacaqları Cəhənnəm odu vardır? Bu isə böyük rüsvayçılıqdır.

68. Allah münafiq kişilərə, münafiq qadınlara və kafirlərə içərisində əbədi qalacaqları Cəhənnəm odu vəd etmişdir. Bu onlara kifayət edər! Allah onlara lənət etmişdir. Onlar üçün daimi bir əzab vardır.

## 11. Hud

118. Əgər Rəbbin istəsəydi, insanları vahid bir ümmət edərdi. Amma onlar elə hey ixtilafdadırlar.
119. Yalnız Rəbbinin rəhm etdiyi şəxslərdən başqa. Allah onları bunun üçün yaratdı. Rəbbinin: "Mən Cəhənnəmi bütün günahkar cinlər və insanlarla dolduracağam!" Sözü yerinə yetəcək.

## 13. ər-Rad

18. Rəbbinin dəvətini qəbul edənlər üçün ən gözəl nemət (Cənnət) hazırlanmışdır. Onun dəvətini qəbul etməyənlərə gəlincə, yer üzündə olan var-dövlətin hamısı, üstəlik bir o qədəri də onların olsaydı, əzabdan qurtarmaq üçün onu mütləq fidyə verərdilər. Onlarla dəhşətli bir haqq-hesab çəkiləcəkdir. Onların sığınacaqları yer Cəhənnəmdir. Ora nə pis yataqdır!

## 14. İbrahim

16. Qabaqda onu Cəhənnəm gözləyir; orada ona irinli su içirdiləcək.
17. O bunu qurtum-qurtum içəcək, amma onu uda bilməyəcəkdir. Ona hər yandan ölüm gələcək, lakin o, ölməyəcəkdir. Bunun ardınca da ağır bir əzab gələcəkdir.
18. Rəbbini inkar edənlərin məsəli – onların əməlləri, qasırğalı bir gündə küləyin şiddətlə sovurduğu külə bənzəyir. Onlar gördükləri işlərə görə savab qazanmazlar. Dərin azğınlıq da elə budur.

22. İş bitdikdə şeytan deyəcək: "Həqiqətən də, Allah sizə gerçək vəd vermişdi. Mən də sizə vəd vermişdim, lakin

vədimə xilaf çıxdım. Mənim sizin üstünüzdə heç bir hökmranlığım yox idi. Mən sizi azğınlığa dəvət etdim, siz də dəvətimi qəbul etdiniz. Buna görə də məni yox, özünüzü qınayın. Nə mən sizin köməyinizə çata bilərəm, nə də siz mənim köməyimə çata bilərsiniz. Heç şübhəsiz ki, mən əvvəllər də sizin məni Allaha şərik qoşmağınızı rədd etmişdim". Həqiqətən, zalımlar üçün ağrılı-acılı bir əzab hazırlanmışdır.

28. Məgər sən Allahın nemətlərini küfrə dəyişənləri və öz xalqını həlak yurduna sürükləyənləri görmürsənmi?
29. Onlar Cəhənnəmə girəcəklər. Ora necə də pis yaşayış yerdir.
30. Onlar insanları Allah yolundan sapdırmaq üçün bütləri Ona tay tutdular. De: "Hələlik əylənin! Şübhəsiz ki, dönüşünüz Odadır".

## 16. ən-Nəhl

28. Mələklər özlərinə zülm edən kimsələrin canlarını aldıqları zaman onlar boyun əyib: "Biz heç bir pislik etmirdik!"– deyəcəklər Onlara deyiləcək: "Xeyr! Şübhəsiz ki, Allah sizin nələr etdiyinizi bilir.
29. Elə isə içində əbədi qalacağınız Cəhənnəmin qapılarına girin! Təkəbbürlülərin qalacağı yer necə də pisdir!"

## 17. əl-İsra

8. … Biz Cəhənnəmi kafirlər üçün bir zindan etdik.

18. Kim gəldi-gedər dünyanı istəsə, orada ona – dilədiyimiz kimsəyə istədiyimiz şeyləri dərhal verərik. Sonra isə onu qınanmış və Allahın rəhmətindən qovulmuş halda girəcəyi Cəhənnəmə atarıq.
19. Kim də Axirəti istəsə, mömin olaraq bütün qəlbi ilə ona can atsa, onların səyi məmnuniyyətlə qəbul olunar.

39. Bunlar Rəbbinin sənə vəhy etdiyi hikmətdəndir. Allahla yanaşı başqa məbuda ibadət etmə, yoxsa qınanmış və qovulmuş halda Cəhənnəmə atılarsan.

61. Bir zaman mələklərə: "Adəmə səcdə edin!"– demişdik. İblisdən başqa hamısı səcdə etdi. O dedi: "Mən Sənin palçıqdan yaratdığınamı səcdə edəcəyəm?!"
62. İblis dedi: "Məndən üstün tutduğuna bir bax! Əgər Qiyamət gününə qədər mənə möhlət versən, az bir qismindən başqa onun bütün nəslini özümə ram edəcəyəm".
63. Allah buyurdu: "Çıx get! Onlardan kim sənə uysa, tam bir əvəz kimi cəzanız Cəhənnəm olacaqdır.
64. Onlardan gücün çatdığı kimsələri səsinlə günaha təhrik et, atlı və piyadanı onların üstünə yerit, mallarına və övladlarına şərik ol, onlara vədlər ver. Şübhəsiz ki, şeytan onlara ancaq yalan vədlər verər.
65. Əslində, Mənim ixlaslı qullarım üzərində sənin hökmün olmayacaqdır. Qoruyan olaraq Rəbbin yetər".

97. Allah kimi doğru yola yönəldirsə, o, doğru yoldadır. Kimi azdırırsa, onlara Ondan başqa dostlar tapa bilməzsən. Qiyamət günü Biz onları kor, lal və kar olduqları halda üzü üstə bir yerə

toplayacağıq. Onların sığınacaqları yer Cəhənnəmdir. Onun alovu azaldıqca onlar üçün alovu artıracağıq.
98. Bu, ayələrimizi inkar etdiklərinə və: "Məgər biz sür-sümük və ovuntu olduğumuz halda yeni bir məxluq olaraq dirildiləcəyik?"– dediklərinə görə onların cəzasıdır.

## 18. əl-Kəhf

100. O gün Biz Cəhənnəmi kafirlərə aşkar göstərərik.
101. O kəslərə ki, gözlərinə Məni anmamaq üçün pərdə çəkmişdilər, özləri də eşidə bilmirdilər.
102. Olmaya, kafirlər Məni qoyub qullarımı özlərinə dost tutacaqlarını güman edirdilər? Həqiqətən, Biz Cəhənnəmi kafirlər üçün mənzil hazırlamışıq.
103. De: "Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi?
104. O kəslər haqqında ki, onların **dünya həyatı**ndakı səyləri boşa çıxmışdır. Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gümanında idilər.
105. Onlar Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar edən, buna görə də bütün əməlləri boşa çıxan kimsələrdir. Odur ki, Qiyamət günü Biz onlara əhəmiyyət verməyəcəyik".
106. Kafir olduqlarına, ayələrimi və elçilərimi lağlağıya qoyduqlarına görə onların cəzası Cəhənnəmdir.

## 19. Məryəm

66. İnsan soruşar: "Doğrudanmı mən öldükdən sonra qəbirdən diri çıxardılacağam?"

67. Məgər insan ilk əvvəl onu heç bir şey deyilkən yaratdığımızı xatırlamırmı?
68. Rəbbinə and olsun ki, Biz onları şeytanlarla birlikdə bir yerə toplayacaq, sonra da onları diz üstə çökmüş halda Cəhənnəmin ətrafına yerləşdirəcəyik.
85. O gün Biz müttəqiləri Mərhəmətli Allahın hüzuruna hörmətli nümayəndələr kimi toplayarıq.
86. Günahkarları isə Cəhənnəmə susamış olduqları halda qovub apararıq.

## 21. əl-Ənbiya

28. Allah onların keçmişini və gələcəyini bilir. Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir və Onun qorxusundan tir-tir əsirlər.
29. Onlardan kimsə: "Mən Ondan başqa bir məbudam!"– desə, ona Cəhənnəmi qismət edərik. Biz zalımları belə cəzalandırırıq.
30. Məgər kafirlər göylərlə yer bir olduğu zaman Bizim onları bir-birindən araladığımızı, hər bir canlını sudan yaratdığımızı görmürlərmi? Yenədəmi inanmırlar?

98. Ey kafirlər! Siz və Allahdan başqa tapındıqlarınız Cəhənnəm odunusunuz. Siz mütləq ora girəcəksiniz.
99. Əgər bunlar məbud olsaydılar, ora girməzdilər. Halbuki hamısı orada əbədi qalacaqlar.
100. Onlar orada xırıldayacaq və heç nə eşitməyəcəklər.

## 22. əl-Həcc

8. İnsanlar içərisində eləsi də vardır ki, heç bir biliyi, doğru yolu göstəricisi və nur saçan bir kitabı olmadan Allah haqqında mübahisə edir.
9. O, başını təkəbbürlə o yan bu yana çevirir ki, insanları Allahın yolundan sapdırsın. O bu dünyada rüsvay olacaq, Qiyamət günü isə Biz ona Cəhənnəm məşəqqətini nəsib edəcəyik.
10. Ona deyiləcəkdir: "Bu, əvvəllər öz törətdiyin əməllərin əvəzidir, yoxsa Allah qullarına əsla zülm edən deyildir".
11. İnsanlardan eləsi də vardır ki, Allaha şübhə ilə ibadət edir. Əgər ona bir xeyir çatsa, onunla rahatlıq tapar. Yox, əgər başına bir iş gəlsə, üz döndərib küfrə qayıdar. O şəxs dünyanı da itirər, axirəti də. Gerçək zərər də elə budur.

19. ... Kafirlər üçün oddan paltar biçiləcək, başlarına da qaynar su töküləcəkdir.
20. Bununla, olanların bətnlərindəkiləri və dərisi əridiləcəkdir.
21. Onlar üçün dəmir toppuzlar da hazırlanmışdır.
22. Onlar hər dəfə oradan çıxmaq, qəmdən qurtarmaq istədikdə yenidən oraya qaytarılacaq və onlara: "Dadın odun əzabını!"– deyiləcəkdir.

51. Ayələrimizi qüvvədən salmağa cəhd göstərənlər isə Cəhənnəm sakinləridirlər.

72. Kafirlərə açıq-aydın ayələrimiz oxunduqda sən onların üzündə nifrət görərsən. Onlar az qalırlar ki, ayələrimizi onlara oxuyanların üstünə cumsunlar. De: "Sizə bundan daha pisini xəbər verimmi? Bu, Cəhənnəmdir! Allah onu kafirlərə vəd etmişdir. O nə pis qayıdış yeridir!"

73. Ey insanlar! Sizə bir məsəl çəkilir. Onu dinləyin. Şübhəsiz ki, Allahdan başqa ibadət etdikləriniz bir milçək belə yarada bilməzlər, hətta bunun üçün bir yerə yığışsalar belə. Əgər milçək onlardan bir şey götürüb aparsa, bunu ondan geri ala bilməzlər. Bunu etmək istəyən də aciz qalar, istənilən də!

## 25. əl-Furqan

11. Lakin onlar (Saatı) Qiyaməti də yalan saydılar. Biz də onu yalan sayanlardan ötrü yandırıb-yaxan bir od hazırladıq.
12. Onlar Cəhənnəm odunu uzaq məsafədən gördükdə belə onun necə qəzəblə qaynamasını duyacaq və xışıltısını eşidəcəklər.
13. Onlar əlləri boynunda bağlı halda Cəhənnəmin dar bir yerinə atıldıqları zaman ölüm diləyərlər.
14. Onlara deyilər: "Bu gün özünüzə bir ölüm deyil, çoxlu-çoxlu ölümlər istəyin!"

33. Onlar sənin yanına gəlib elə bir məsəl çəkməzlər ki, ona cavab olaraq Biz sənə haqqı və ən yaxşı yozumu verməyək.
34. Üzüstə sürüklənib Cəhənnəmə toplanılacaq kimsələr – məhz onlar yerləri ən pis olan, haqq yoldan ən çox azan kimsələrdir.

63. Mərhəmətli Allahın qulları o kəslərdir ki, onlar yer üzündə təvazökarlıqla gəzər, cahillər onlara xoşagəlməz bir söz dedikdə: "Salam!"- deyərlər.
64. Onlar gecələrini Rəbbi üçün səcdədə və qiyamda keçirərlər.

65. Onlar deyərlər: "Ey Rəbbimiz! Cəhənnəm əzabını bizdən uzaq elə. Doğrusu, onun əzabı həmişəlikdir.
66. Həqiqətən, o, nə pis məskən, necə də pis iqamətgahdır!"

## 26. əş-Şuəra

91. Cəhənnəm də azğınlara göstərilər.
92. Onlara deyilər: "Hanı sizin sitayiş etdikləriniz –
93. Allahdan başqa pənah apardıqlarınız? Onlar sizə kömək edə bilərlərmi,
yaxud özlərinə kiməkləri dəyə bilərmi?"
94. Onlar azğınlarla birlikdə oraya (Cəhənnəmə) atılarlar,
95. İblisin bütün əsgərləri də habelə.
96. Onlar orada höcətləşərək deyərlər:
97. "Allaha and olsun ki, biz açıq-aydın azğınlıq içində idik –
98. o vaxt ki, biz sizi aləmlərin Rəbbinə tay tuturduq.
99. Bizi ancaq günahkarlar azdırdı.
100. İndi isə bizim nə şəfaətçilərimiz,
101. nə də bizə canıyanan bir dostumuz var!
102. Bir də dünyaya qayıda bilsəydik, möminlərdən olardıq!"

## 28. əl-Qasas

60. Sizə verilən hər şey ancaq **dünya həyatı**nın keçici zövqü və onun bərbəzəyidir. Allah yanında olanlar isə daha xeyirli və daha sürəklidir. Məgər başa düşmürsünüz?
61. Məgər verdiyimiz gözəl bir vədə (Cənnətə) qovuşan kimsə, dünya həyatının keçici zövqünü bəxş etdiyimiz, sonra da qiyamət günü Cəhənnəmə gətiriləcək kimsə ilə eyni ola bilərmi?

## 29. əl-Ənkəbut

54. Onlar səndən əzabın tez gəlməsini istəyirlər. Şübhəsiz ki, Cəhənnəm kafirləri bürüyəcəkdir.
55. O gün əzab onları başlarının üstündən və ayaqlarının altından əhatə edəcəkdir. Allah deyəcəkdir: "Etdiyiniz əməllərin cəzasını dadın!"

## 31. Loğman

21. Onlara: "Allahın nazil etdiyinə itaət edin!"– deyildikdə, onlar: "Yox! Biz əcdadımızın getdiyi yolu tutub gedəcəyik!"– deyərlər. Əgər şeytan onları Cəhənnəm odunun əzabına doğru sürükləyirsə necə olsun?
22. Yaxşı əməl sahibi olub özünü Allaha təslim edən şəxs ən möhkəm dəstəkdən yapışmış olar. Bütün işlərin sonu Allaha qayıdır.
23. Kafirin küfr etməsi səni kədərləndirməsin. Onların dönüşü Bizə olacaq. Biz də onlara etdikləri əməllər barədə xəbər verəcəyik. Həqiqətən, Allah kökslərdə olanları bilir.

## 32. əs-Səcdə

13. Əgər Biz istəsəydik, hər kəsi doğru yola yönəldərdik. Lakin Mənim: "Cəhənnəmi mütləq bütün günahkar cin və insanlarla dolduracağam!" Sözüm yerinə yetəcək.
14. Bu gününüzlə qarşılaşacağınızı unutduğunuza görə dadın əzabı! Doğrusu, Biz də sizi unutduq. Etdiyiniz əməllərə görə dadın əbədi əzabı!

15. Ayələrimizə ancaq o kəslər iman gətirirlər ki, ayələrimiz onlara xatırlanarkən təkəbbür göstərmədən səcdəyə qapanır, Rəbbinə həmd-səna ilə təriflər deyirlər.

## 34. Səba

42. Bu gün bir-birinizə nə bir xeyir, nə də bir zərər verə bilərsiniz. Biz zalımlara: "Dadın yalan saydığınız Cəhənnəm əzabını!"– deyəcəyik.
43. Ayələrimiz onlara açıq-aydın oxunduğu zaman: "Bu ancaq sizi atalarınızın ibadət etdiklərindən döndərmək istəyən bir adamdır!"– deyərlər. Onlar: "Bu, uydurma yalandan başqa bir şey deyildir!"– deyərlər. Kafirlərə haqq gəldikdə onun barəsində: "Bu yalnız açıq-aydın bir sehrdir!"– deyərlər.

## 35. Fatir

36. Kafirləri isə Cəhənnəm odu gözləyir. Orada nə öldürülməzlər ki, ölüb canları qurtarsın, nə də bu odun əzabı onlar üçün yüngülləşdirilər. Biz hər bir kafiri belə cəzalandırırıq.
37. Onlar orada fəryad qoparıb yalvaracaqlar: "Ey Rəbbimiz! Bizi buradan çıxart ki, əvvəllər etdiyimiz əməlləri deyil, yaxşı əməllər edək". Onlara deyiləcək: "Məgər orada sizə düşünəcək kimsənin düşünə biləcəyi qədər uzun ömür vermədikmi? Sizə qorxudub xəbərdar edən də gəlmişdi. Elə isə dadın əzabı! Zalımlara kömək edən olmaz".
38. Şübhəsiz ki, Allah göylərin və yerin qeybini Biləndir. O, kökslərdə olanları da Bilir.

## 36. Ya sin

59. "Bu gün möminlərdən ayrılın, ey günahkarlar!
60. Ey Adəm övladları! Məgər Mən sizə buyurmadımmı ki, şeytana ibadət etməyin, o sizin açıq-aydın düşməninizdir,
61. Mənə ibadət edin? Doğru yol budur!
62. Artıq şeytan içərinizdən bir çoxlarını yoldan çıxartmışdır. Məgər dərk etmirdiniz?
63. Bu sizə vəd edilmiş Cəhənnəmdir.
64. Kafir olduğunuza görə bu gün orada yanın!"
65. Bu gün onların ağızlarına möhür vurarıq. Qazandıqları günahlar barəsində onların əlləri Bizimlə danışar, ayaqları da şəhadət verər.

## 37. əs-Saffat

22. Mələklərə belə əmr olunacaq: "Toplayın bir yerə zalımları, onların yoldaşlarını və ibadət etdiklərini –
23. Allahdan başqa. Onları Cəhənnəm yoluna yönəldin.

50. Onlar bir-birilərinə tərəf dönüb soruşacaqlar.
51. Onlardan biri deyəcək: "Mənim bir yoldaşım var idi.
52. O deyirdi: "Sən də inananlardansan?
53. Məgər biz öldükdən, torpağa çevrilib sür-sümük olduqdan sonra haqqhesaba çəkilib cəzalandırılacağıq?"
54. O sözünə davam edib deyəcək: "Siz onun harada olduğunu görmək istəyirsinizmi?"
55. O özü baxıb yoldaşını Cəhənnəmin ortasında görəcək
56. və deyəcəkdir: "Allaha and olsun ki, sən məni də məhv edəcəkdin.

57. Əgər Rəbbimin lütfü olmasaydı, mən də Cəhənnəmə gətirilənlərdən olardım.
58. Doğrudanmı biz bir daha ölməyəcəyik –
59. ilk ölümümüzdən başqa? Doğrudanmı biz heç vaxt əzaba düçar olmayacağıq?"
60. Həqiqətən, bu, böyük uğurdur.
61. Qoy çalışanlar bunun üçün çalışsınlar!
62. Bu, ziyafət üçün yaxşıdır, yoxsa zəqqum ağacı?
63. Biz onu zalımlar üçün bir sınaq etdik.
64. O, Cəhənnəmin lap dibindən bitib çıxan bir ağacdır.
65. Onun meyvəsi şeytanların başları kimidir.
66. Günahkarlar ondan yeyib qarınlarını dolduracaqlar.
67. Sonra da üstündən onları qaynar su ilə qatışdırılmış bir içki gözləyir.
68. Sonra onlar mütləq Cəhənnəmə qaytarılacaqlar.
69. Həqiqətən, onlar ata-babalarını azmış gördülər,
70. özləri də tez-tələsik onların izini tutub getdilər.

## 38. Sad

55. Bax belə! Şübhəsiz ki, azğınları da çox pis qayıdış yeri gözləyir –
56. içində yanacaqları Cəhənnəm. Ora nə pis yataqdır!
57. Bu, qaynar su və irindir. Qoy onu dadsınlar!
58. Kafirlər üçün əzabın buna bənzər başqa növləri də vardır.
59. Kafirlərin başçılarına deyiləcək: "Bu sizinlə birlikdə Cəhənnəmə girən dəstədir. Başçılar deyəcəklər: "Onlara salam olmasın! Şübhəsiz ki, onlar odda yanacaqlar".
60. Tabe olanlar deyəcəklər: "Xeyr, sizin özünüzə salam olmasın! Bunu bizə siz təqdim edirdiniz. Ora necə də pis qərar tutulan yerdir!"

61. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Bunu bizə kim təqdim edibsə, onun əzabını odda ikiqat elə!"
62. Günahkarlar deyəcəklər: "Bizə nə olub ki, dünyada ikən pis adamlar saydığımız kişiləri burada görmürük?
63. Biz onları haqsızcasınamı məsxərəyə qoyurduq? Nə isə, onlar gözə dəymirlər?"
64. Şübhəsiz ki, bu, od sakinlərinin bir-biri ilə höcətləşməsi bir həqiqətdir.

84. Allah dedi: "Budur haqq! Mən yalnız haqqı deyirəm!
85. Mən Cəhənnəmi səninlə və sənə tabe olanların hamısı ilə dolduracağam!"
86. De: "Mən buna görə sizdən heç bir mükafat istəmirəm və mən özümdən bir şey uydurmağa çalışmıram.
87. Bu Quran aləmlərə ancaq xatırlatmadır.
88. Siz onun verdiyi xəbəri bir vaxtdan sonra mütləq biləcəksiniz!"

## 39. əz-Zumər

8. İnsana bir zərər toxunduqda Rəbbinə üz tutub təkcə Ona yalvarır. Sonra Allah Özündən insana bir nemət verəndə o, əvvəlcə kimə yalvardığını unudur və insanları Allahın yolundan çıxartmaq məqsədilə Ona şəriklər qoşur. De: "Küfrünlə bu dünyada bir az dolan. Şübhəsiz ki, sən Cəhənnəm sakinlərindənsən!"

71. Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcəklər. Nəhayət, ora çatdıqda

onun qapıları açıq olacaq və onun gözətçiləri onlara deyəcəklər: "Məgər öz içərinizdən Rəbbinizin ayələrini sizə oxuyan və sizi bu gününüzə qovuşacağınızla xəbərdar edən elçilər gəlməmişdi?" Onlar: "Əlbəttə, gəlmişdi!"– deyəcəklər. Lakin əzab Sözü kafirlər barəsində gerçəkləşdi.
72. Onlara: "İçində əbədi qalacağınız Cəhənnəmin qapılarına girin!"– deyiləcək. Təkəbbürlülərin yeri necə də pisdir!

## 40. Ğafir

7. Ərşi daşıyanlar və onun ətrafındakılar öz Rəbbinə həmd edərək onu tərifləyir, Ona iman gətirir və möminlər üçün də bağışlanma diləyirlər: "Ey Rəbbimiz! Sən mərhəmətin və elminlə hər şeyi əhatə edirsən. Tövbə edib Sənin yolunla gedənləri bağışla, onları Cəhənnəm əzabından xilas et!

49. Odda olanlar Cəhənnəm gözətçilərinə deyəcəklər: "Rəbbinizə yalvarın ki, heç olmasa, bircə gün əzabımızı yüngülləşdirsin!"
50. Mələklər deyəcəklər: "Məgər elçiləriniz açıq-aydın dəlillər gətirməmişdilər?" Onlar: "Əlbəttə gətirmişdilər!"– deyəcəklər. Mələklər də: "Elə isə özünüz yalvarın!"– deyəcəklər. Kafirlərin yalvarması isə boş şeydir.
51. Şübhəsiz ki, Biz Öz elçilərimizə və möminlərə həm **dünya həyatı**nda, həm də şahidlərin şəhadət verəcəyi gün yardım edəcəyik.
52. O gün zalımlara üzr diləmələri heç bir fayda verməyəcəkdir. Onları həm lənət, həm də pis yurd gözləyir.

60. Rəbbiniz dedi: "Mənə dua edin, Mən də sizə cavab verim. Həqiqətən, Mənə ibadət etməyə təkəbbür göstərənlər Cəhənnəmə zəlil olaraq girəcəklər".

74. Allahdan başqa ibadət etdikləriniz?" Onlar deyəcəklər: "Onlar bizi qoyub qaçdılar. Xeyr, biz öncə də heç bir şeyə ibadət etmirdik!" Allah kafirləri beləcə azğınlığa salar.
75. "Bu sizin yer üzündə nahaq yerə sevinməyinizə və qürrələnməyinizə görədir!
76. İçində əbədi qalacağınız Cəhənnəmin qapılarına girin!" Təkəbbürlülərin yeri necə də pisdir!

## 41. Fussilət

19. Allaha yağı kəsilənlər Cəhənnəmə sürüklənib toplanılacaqları günə qədər bir yerdə saxlanacaqlar.
20. Nəhayət, onlar oraya gəldikləri zaman qulaqları, gözləri və dəriləri etdikləri əməllər barəsində onların əleyhinə şahidlik edəcəkdir.
21. Onlar öz dərilərinə: "Nə üçün əleyhimizə şahidlik edirsiniz?"– deyəcəklər. Dəriləri deyəcək: "Hər şeyi danışdıran Allah bizi danışdırdı. Sizi ilk dəfə O yaratmışdır və siz axırda Ona qaytarılacaqsınız".
22. Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şahid olmasından çəkinib gizlənmirdiniz. Əksinə, elə zənn edirsiniz ki, Allah sizin etdiyiniz əməllərin çoxunu bilmir.
23. Sizin öz Rəbbiniz barəsində bu zənniniz sizi məhv etdi və siz ziyan çəkənlərdən oldunuz.

## 42. əş-Şura

45. Cəhənnəm qarşısına gətirildikləri zaman sən onların zəlillikdən başlarını aşağı salıb gözucu gizlin-gizlin baxdıqlarını görəcəksən. Möminlər deyəcəklər: "Şübhəsiz ki, ziyana uğrayanlar Qiyamət günü özlərini və ailələrini itirənlərdir". Həqiqətən, zalımlar daimi əzab içində olacaqlar.
46. Onlara Allahdan başqa kömək edəcək dostlar olmayacaqdır. Allah kimi azğınlığa salsa, onun üçün heç bir qurtuluş yolu olmaz.
47. Allah tərəfindən qarşısıalınmaz gün gəlməmişdən əvvəl Rəbbinizin çağırışına cavab verin! O gün sizin üçün heç bir sığınacaq olmayacaq və siz günahlarınızı inkar edə bilməyəcəksiniz.

## 43. əz-Zuxruf

74. Şübhəsiz ki, günahkarlar əbədi olaraq Cəhənnəm əzabı içində qalacaqlar.
75. Onların əzabı yüngülləşdirilməyəcək və onlar orada naümid qalacaqlar.
76. Biz onlara zülm etmədik, lakin onlar özləri zalım idilər.
77. Onlar Cəhənnəm gözətçisini çağırıb deyəcəklər: "Ey Malik! Qoy Rəbbin canımızı alıb qurtarsın!" O isə: "Siz burada əbədi qalacaqsınız!"– deyəcək.
78. Biz sizə haqqı təqdim etdik, lakin çoxunuz haqqı xoşlamırdı.

## 44. əd-Duxan

43. Həqiqətən, zəqqum ağacı
44. günahkar adamın yeməyidir.
45. Əridilmiş yağın çöküntüsü kimi qarınlarda qaynayar –

46. qaynar su qaynayan kimi.
47. Onu tutub Cəhənnəmin ortasına sürüyün!
48. Sonra əzab vermək üçün başına qaynar su tökün!
49. Dad bu əzabı! Sən ki qüdrətli və şərəfli idin.
50. Sizin şübhə etdiyiniz əzab budur!

## 45. əl-Casiyə

7. Vay halına iftiraçının və günahkarın!
8. O, Allahın ona oxunan ayələrini eşidir və sonra, sanki onları eşitməmiş kimi təkəbbür göstərərək inadkarlıq edir. Beləsini ağrılı-acılı bir əzabla müjdələ.
9. O, ayələrimizdən bir şey öyrəndiyi zaman ona lağ edir. Məhz belələri üçün alçaldıcı bir əzab vardır.
10. Qarşıda onları Cəhənnəm gözləyir. Nə qazandıqları şeylər, nə də Allahdan başqa tutduqları himayəçilər onları əzabdan qurtara bilməyəcəklər. Onları böyük bir əzab gözləyir.
11. Bu Quran doğru yol göstəricisidir. Rəbbinin ayələrini inkar edənləri ən pis cəza – ağrılı-acılı əzab gözləyir.

31. Kafir olanlara gəldikdə isə, onlara deyiləcəkdir: "Məgər ayələrim sizə oxunmurdumu? Siz isə təkəbbür göstərirdiniz və günahkar adamlar idiniz.
32. Sizə: "Allahın vədi haqdır və o Saata heç bir şəkk-şübhə yoxdur!"– deyildiyi zaman: "Biz o Saatın nə olduğunu bilmirik! Onun ancaq bir zənn olduğunu güman edirik. Biz buna əmin deyilik!"– deyirdiniz".
33. Onların etdikləri pis əməllər özlərinin qarşısına çıxacaq, istehza etdikləri əzab onları bürüyəcək
34. və onlara deyiləcəkdir: "Siz bu gününüzlə qarşılaşacağınızı unutduğunuz kimi, Biz də bu gün sizi unudacağıq. Sizin

sığınacaq yeriniz Cəhənnəmdir. Sizin köməkçiləriniz də olmayacaqdır.
35. Bu ona görədir ki, siz Allahın ayələrini məsxərəyə qoyurdunuz və **dünya həyatı** sizi aldatmışdı". Bu gün onlar oradan çıxarılmayacaq və onlardan tövbə etmələri tələb olunmayacaqdır.
36. Göylərin Rəbbi, yerin Rəbbi və aləmlərin Rəbbi olan Allaha həmd olsun!
37. Göylərdə və yerdə böyüklük yalnız Ona məxsusdur. O, Qüdrətlidir, Müdrikdir.

## 48. əl-Fəth

6. Həm də ona görədir ki, Allah Özü barəsində pis fikirdə olan münafiq kişi və münafiq qadınlara, müşrik kişi və müşrik qadınlara əzab versin. Onların pis niyyəti özlərini bəlaya salsın! Allahın onlara qəzəbi tutmuşdur. Allah onları lənətləmiş və onlar üçün Cəhənnəm hazırlamışdır. Ora nə pis dönüş yeridir.

## 50. Qaf

24. Allah əmr edib deyəcək: "Atın Cəhənnəmə hər bir inadcıl kafiri,
25. xeyrə mane olanı, azğınlaşıb həddi aşanı, şübhə edəni,
26. başqa bir məbudu Allaha tay tutanı. Atın onu şiddətli əzabın içinə!"
27. Yoldaşı (şeytan) deyəcəkdir: "Ey Rəbbimiz! Onu mən yoldan çıxartmadım, əksinə, o özü dərin azğınlıq içində idi!"
28. Allah deyəcəkdir: "Mənim hüzurumda höcətləşməyin. Mən əvvəlcədən

sizi xəbərdar etmişdim.
29. Mənim Sözüm dəyişməzdir. Mən bəndələrə zülm edən deyiləm!"
30. O gün Biz Cəhənnəmə: "Doldunmu?"– deyəcəyik. O isə: "Yenə varmı?"– deyəcəkdir.

## 51. əz-Zəriyət

10. Məhv olsun yalançılar!
11. O kəslər ki, cəhalət içində olan qafillərdir.
12. Onlar Haqq-hesab gününün nə vaxt olacağını soruşurlar.
13. O gün onlara odda əzab veriləcəkdir.
14. Onlara deyiləcək: "Dadın əzabınızı! Sizin tez-tələsik gəlməsini istədiyiniz şey budur!"

## 52. ət-Tur

11. O gün vay halına haqqı yalan sayanların!
12. O kəslərin ki, yalan bataqlığında əylənirlər.
13. O gün onlar amansızcasına sürüdülərək Cəhənnəm oduna atılacaqlar.
14. Onlara deyiləcək: "Bu sizin yalan saydığınız Cəhənnəm odudur!
15. Bəlkə bu da sehrdir, siz görmürsünüz?
16. Yanın orada! Dözsəniz də, dözməsəniz də sizin üçün eynidir. Sizə ancaq etdiyiniz əməllərin cəzası verilir".

## 55. ər-Rahmən

31. Ey ağır yükü olan insan və cin tayfası! Tezliklə ancaq sizinlə məşğul olacağıq.
32. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
33. Ey cin və insan tayfası! Əgər göylərin və yerin hüdudlarını yarıb keçə bilərsinizsə, keçin! Siz ancaq qüdrət və qüvvətlə keçə bilərsiniz.
34. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
35. Sizin üstünüzə tüstüsüz alov və ərimiş mis (və ya tüstü) göndəriləcək və siz bir-birinizə kömək edə bilməyəcəksiniz.
36. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
37. Göy yarılıb dağ edilmiş yağ (yaxud ərinmiş qurğuşun) kimi qıpqırmızı olacaqdır.
38. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
39. O gün nə insan, nə də cin günahı barəsində sorğu-sual olunmayacaqdır.
40. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
41. Günahkarlar simalarından tanınacaq, kəkillərindən və ayaqlarından yaxalanacaqlar.
42. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
43. Budur günahkarların yalan hesab etdikləri Cəhənnəm!
44. Onlar onunla qaynar su arasında dolanacaqlar.

## 56. əl-Vaqiə

41. Sol tərəf sahibləri. Nə bədbəxtdir sol tərəf sahibləri!
42. Onlar qızmar yel və qaynar su içində,
43. qapqara duman kölgəsində olacaqlar.
44. Bu duman nə sərin, nə də xoşagələndir.
45. Onlar bundan əvvəl cah-calal içində idilər,
46. böyük günah işlətməkdə israr edirdilər

47. və deyirdilər: "Məgər biz ölüb torpaq və sür-sümük olduqdan sonra yenidənmi dirildiləcəyik?
48. Yaxud bizim əcdadlarımız dirildiləcəklərmi?"
49. De: "Şübhəsiz ki, əvvəlkilər də, sonrakılar da,
50. bəlli bir günün müəyyən vaxtında mütləq toplanılacaqlar.
51. Sonra, siz ey doğru yoldan azanlar, haqqı yalan sayanlar!
52. Siz mütləq zəqqum ağacından yeyəcəksiniz,
53. qarınlarınızı onunla dolduracaqsınız,
54. üstündən də qaynar su içəcəksiniz.
55. Siz onu susamış xəstə dəvələr kimi içəcəksiniz".
56. Bu onların Haqq-hesab günündəki ziyafətidir.

71. Yandırdığınız odu gördünüzmü?
72. Onun ağacını siz yaradırsınız, yoxsa Biz yaradırıq?
73. Biz onu Cəhənnəmi yada salmaq və müsafirlərin istifadəsi üçün yaratdıq.

## 57. əl-Hədid

19. Allaha və Onun elçilərinə iman gətirənlər – məhz onlar doğru olanlardır. Şəhidlər isə öz Rəbbi yanındadırlar. Onların öz mükafatları və öz nurları vardır. Kafir olub ayələrimizi yalan sayanlara gəlincə, onlar Cəhənnəm sakinləridir.

## 58. əl-Mucadilə

8. Gizli söhbət qadağan ediləndən sonra yenə də qadağan olunmuş əmələ qayıdıb günah, düşmənçilik və Peyğəmbərə qarşı çıxmaq barədə öz aralarında xısın-xısın danışanları görmədinmi? Onlar sənin yanına gəldikdə səni Allahın salamladığı kimi salamlamır və öz-özlərinə: "Bəs niyə Allah

bizi dediklərimizə görə cəzalandırmır?"– deyirlər. Cəhənnəm onlara yetər. Onlar orada yanacaqlar. Ora necə də pis dönüş yeridir.

14. Məgər sən, Allahın qəzəbləndiyi adamlarla dostluq edənləri görmədinmi? Onlar nə sizdəndirlər, nə də onlardan. Onlar bilə-bilə yalandan and içirlər.
15. Allah onlar üçün şiddətli bir əzab hazırlamışdır. Onların etdiyi əməllər necə də pisdir.
16. Onlar andlarını özlərinə sipər edib insanları Allah yolundan döndərdilər. Onları alçaldıcı bir əzab gözləyir.
17. Allaha qarşı nə malları, nə də övladları onlara heç bir fayda verə bilməyəcək. Onlar Cəhənnəm sakinləridir və orada əbədi qalacaqlar.
18. Allah onların hamısını dirildəcəyi gün onlar sizə and içdikləri kimi, Ona da and içəcək və nə isə əldə etdiklərini güman edəcəklər. Əslində, onlar əsl yalançılardır.
19. Şeytan onları üstələmiş və Allahı zikr etməyi onlara unutdurmuşdur. Onlar şeytanın firqəsindəndirlər. Şübhə yoxdur ki, şeytanın firqəsindəkilər ziyana uğrayanlardır.
20. Məhz Allaha və Onun Elçisinə qarşı çıxanlar ən zəlil kimsələr arasında olacaqlar.

## 59. əl-Həşr

19. Allahı unudan, buna görə də Allahın onları özlərinə unutdurduğu kəslər kimi olmayın! Onlar fasiqlərdir.
20. Cəhənnəm əhli ilə Cənnət əhli eyni deyillər. Cənnət əhli uğur qazananlardır.

21. Əgər Biz bu Quranı dağa nazil etsəydik, sən onun Allahın qorxusundan boyun əyib parça-parça olduğunu görərdin. Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, fikirləşələr.

## 64. əl-Təğabun

9. O gün Allah sizi Toplanma gününə cəm edəcək. Həmin gün qarşılıqlı aldanma günüdür. Hər kəs Allaha iman gətirib yaxşı işlər görsə, Allah onun günahlarını bağışlayar və onu ağacları altından çaylar axan Cənnət bağlarına daxil edər. Onlar orada əbədi qalacaqlar. Bu, böyük müvəffəqiyyətdir.
10. Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar Cəhənnəm sakinləridir. Onlar orada əbədi qalacaqlar. Ora necə də pis dönüş yeridir!

## 67. əl-Mulk

6. Rəbbinə qarşı çıxanlar Cəhənnəm əzabına düçar olacaqlar. Ora nə pis dönüş yeridir.
7. Onlar oraya vasil ediləndə onun dəhşətli uğultuyla qaynadığını eşidəcəklər.
8. Cəhənnəm, qəzəbindən az qala parçalansın. Hər dəfə bir dəstə oraya atılarkən Cəhənnəmin gözətçiləri onlardan soruşacaqlar: "Məgər sizə xəbərdarlıq edən bir peyğəmbər gəlməmişdi?"
9. Onlar deyəcəklər: "Əlbəttə, bizə qorxudan bir peyğəmbər gəlmişdi. Amma biz onu yalançı sayıb: "Allah heç bir şey nazil etməyib, siz də ancaq böyük bir azğınlıq içindəsiniz"– demişdik.
10. Onlar deyəcəklər: "Əgər biz dinləsəydik və ya anlasaydıq alov şölələri saçan od sakinlərinin içində olmazdıq!"

11. Onlar öz günahlarını etiraf edəcəklər. Rədd olsun alovlu od sakinləri!

## 69. əl-Həqqa

25. Kitabı sol əlinə verilən kimsə isə deyəcəkdir: "Kaş kitabım mənə verilməyəydi!
26. Hesabımdan da xəbərim olmayaydı!
27. Kaş ilk ölümüm həmişəlik olaydı!
28. Var-dövlətim məni əzabdan qurtarmadı.
29. Hökmranlığım da məhv olub getdi".
30. Mələklərə deyiləcək: "Onu yaxalayıb zəncirləyin!
31. Sonra da Cəhənnəmə atın!
32. Onu uzunluğu yetmiş dirsək olan zəncirə vurun!
33. Çünki o, Böyük Allaha iman gətirmirdi,
34. və heç kəsi kasıbı yedirtməyə rəğbətləndirmirdi.
35. Bu gün burada onun üçün bir dost tapılmaz.
36. Qanlı irindən başqa yeməyi də yoxdur.
37. Onu ancaq günahkarlar yeyər".

## 72. əl-Cinn

11. (Cinlər dedilər) "Əlbəttə, aramızda xeyirxah əməl sahibləri də, onlar kimi olmayanlar da var. Biz ayrı-ayrı yollar tutmuşuq.
12. Yəqin etdik ki, yer üzündə Allahdan yaxa qurtara bilmərik. Göyə qaçmalı olsaq da Onun əzabından yayına bilməyəcəyik.
13. Biz doğru yolu göstərən rəhbəri eşitdiyimiz zaman ona iman gətirdik. Rəbbinə iman gətirən, nə savabının azalmasından, nə də haqsızlığa uğramaqdan qorxmaz.

14. Sözsüz ki, bizlərdən müsəlmanlar da var, doğru yoldan sapanlar da. Müsəlman olan şəxslər doğru yol tutanlardır.
15. Doğru yoldan sapanlar Cəhənnəm üçün odun olacaqlar".

22. (Allah öz rəsuluna deyir) De: "Həqiqətən, məni Allahdan kimsə xilas edə bilməz və mən Ondan başqa bir pənah yeri tapa bilmərəm!
23. Mənim əlimdən gələn ancaq Allahı və Onun göndərdiklərini təbliğ etməkdir. Kim Allaha və Onun Elçisinə asi olarsa, onun üçün içərisində əbədi qalacaqları Cəhənnəm odu hazırlanmışdır".
24. Onlar özlərinə vəd olunmuş əzabı gördükləri zaman kimin köməkçisinin daha zəif və sayca daha az olduğunu biləcəklər.
25. De: "Mən sizə vəd olunmuş əzabın yaxın olduğunu və yaxud Rəbbimin onun üçün uzun bir müddət təyin etmiş olduğunu bilmirəm.
26. O, qeybi Biləndir və Öz qeybini heç kəsə açmaz."

## 73. əl-Muzzəmmil

11. Məni, ayələrimi yalan sayan var-dövlət sahibləri ilə tək burax və onlara bir az möhlət ver.
12. Həqiqətən, Bizdə onlar üçün qandallar və Cəhənnəm hazırlanmışdır,
13. boğazda tıxanıb keçməyən yemək və ağrılı-acılı bir əzab da vardır.
14. O gün yer və dağlar titrəyəcək, dağlar səpələnən qum təpəsinə dönəcəkdir.

35. Doğrudan da o Cəhənnəm ən böyük fəlakətdir,
36. həm bəşəriyyət üçün,
37. həm də sizlərdən yaxşı işlər görüb irəli çıxmaq və ya günah edib geriyə düşmək istəyənlər üçün bir xəbərdarlıqdır.

## 77. əl-Mursəlat

28. Qiyaməti yalan sayanların o Gün vay halına!
29. Onlara belə deyiləcək: "Gedin yalan hesab etdiyiniz Cəhənnəmə!
30. Üç qola ayrılan kölgəliyə gedin!"
31. Ora nə kölgə salır, nə də alovdan qoruyur.
32. Cəhənnəm hərəsi hündür imarət həcmində qığılcımlar püskürür.
33. Onlar sanki sarı dəvələrdir.
34. Qiyaməti yalan sayanların o Gün vay halına!
35. Bu, günahkarların danışa bilməyəcəkləri bir gündür.
36. Onlara üzrxahlıq üçün izin belə verilməyəcəkdir.
37. Qiyaməti yalan sayanların o Gün vay halına!

## 78. ən-Nəbə

21. Həqiqətən, Cəhənnəm kafirlər üçün pusquda dayanıb gözləyir.
22. O, həddi aşanların qayıdacağı yerdir.
23. Onlar orada əsrlər boyu qalacaqlar.
24. Onlar orada nə bir sərinlik, nə də sərinlədici içki dadacaqlar.

25. İçdikləri yalnız qaynar su və irin olacaq –
26. Törətdikləri əməllərinə uyğun bir cəza kimi.
27. Doğrusu, onlar haqq-hesab çəkiləcəklərinə ümid etmirdilər.
28. Ayələrimizi də qətiyyətlə yalanlayırdılar.
29. Biz hər bir şeyi hesablayıb yazmışıq.
30. Elə isə dadın əzabı! Biz sizə əzabdan başqa bir şey artırmayacağıq!

## 79. ən-Nəziət

34. Ən böyük fəlakətin gəldiyi zaman –
35. o gün insan törətdiklərini xatırlayacaqdır.
36. Cəhənnəm isə hər görmə qabiliyyətliyə göstəriləcəkdir.
37. Kim həddi aşmışsa,
38. **dünya həyatı**nı axirətdən üstün bilmişsə,
39. həqiqətən, Cəhənnəm onun sığınacağı olacaqdır.

## 81. ət-Təkvir

12. Cəhənnəm alovlandırılacağı zaman
13. və Cənnət möminlərə yaxınlaşdırılacağı zaman,
14. hər kəs bu gün üçün özünə nə tədarük etdiyini biləcəkdir.

## 83. əl-Mutaffifin

16. Sonra onlar Cəhənnəmə girəcəklər
17. və onlara deyiləcək: "Budur sizin yalan hesab etdiyiniz Cəhənnəm!"

## 85. əl-Buruc

10. O kəslər ki, mömin kişi və qadınları yandırmaqla sınağa çəkmiş, sonra da tövbə etməmişlər, onlara Cəhənnəm əzabı və onları yandırıb-yaxacaq od əzabı hazırlanmışdır.

## 87. əl-Əla

11. Ən bədbəxt kimsələr isə onu qulaqardına vurarlar.
12. O kimsə ki, Cəhənnəmə atılacaq,
13. O orada nə ölə, nə də yaşaya bilməyəcəkdir.
14. Günahlardan təmizlənən kimsə isə uğur qazanmışdır.
15. O kimsə ki, Rəbbinin adını xatırlayıb namaz qılmışdır.
16. Xeyr, siz **dünya həyatı**nı olduqca üstün tutursunuz;
17. Axirət isə daha xeyirli və daha sürəklidir.

## 89. əl-Fəcr

21. Xeyr! Elə ki yer lərzəyə gəlib parça-parça olacaq,
22. sənin Rəbbin və səf-səf düzülmüş mələklər gələcək
23. və o gün Cəhənnəm gətiriləcək. O gün insan günahlarını xatırlayacaqdır. Lakin bu xatırlamanın ona nə faydası?
24. O: "Kaş axirət həyatım üçün əvvəlcədən hazırlıq görəydim!"– deyəcəkdir.
25. O gün heç kəs Onun verdiyi əzab kimi əzab verə bilməz
26. və heç kəs Onun buxovladığı kimi buxovlaya bilməz.

## 92. əl-Leyl

8. Kim də xəsislik edərək Rəbbinə ehtiyacı olmadığını güman edirsə
9. və ən gözəl olanı (lə ilahə illəllahı) yalan hesab edirsə,
10. Biz onun üstünə ən çətin olanı yükləyəcəyik.
11. Cəhənnəmə düşdükdə var-dövləti ona fayda verməyəcək.
12. Şübhəsiz ki, doğru yola yönəltmək Bizə aiddir.
13. Sözsüz ki, Axirət də, **dünya həyatı** da Bizimdir.
14. Mən sizi alov saçan bir odla qorxutdum.
15. Ona ancaq ən bədbəxt kimsə girər.
16. O kimsə ki, haqqı yalan sayır və ondan üz döndərir.
17. Allahdan ən çox qorxan isə o Oddan uzaqlaşdırılar.
18. O kimsə ki, malını Allah yolunda verir, günahlardan təmizlənir.
19. Əvəzi veriləcək nemət üçün onun heç kəsə minnəti olmaz.
20. O bunu ancaq Ən Uca Rəbbinin Üzünü dilədiyindən edər.
21. O, mütləq razı qalacaqdır!

## 95. ət-Tin

4. Biz insanı ən gözəl surətdə yaratdıq!
5. Sonra isə onu aşağı qatların ən aşağısına (Cəhənnəmin dibinə) qaxacağıq.
6. İman gətirib xeyirxah işlər görənlər istisna olmaqla! Onlar üçün tükənməz mükafat hazırlanmışdır.

## 98. əl-Beyyinə

6. Həqiqətən, Kitab əhlindən və müşriklərdən inkar edənlərin məskəni Cəhənnəm odu olacaq və orada əbədi qalacaqlar. Onlar məxluqatın ən pisləridir.

## 102. ət-Təkəsur

5. Xeyr! Kaş ki, yəqin biləydiniz.
6. Siz Cəhənnəmi mütləq görəcəksiniz!
7. Onu həqiqətən öz gözünüzlə mütləq görəcəksiniz!
8. Sonra, o gün nemətlər barəsində hökmən sorğu-suala tutulacaqsınız.

# Cənnət haqqında ayələr



**2 əl-Bəqərə**

25. İman gətirib saleh əməllər edənlərə müjdə ver ki, onlardan ötrü üçün ağacları altından çaylar axan Cənnət bağları vardır Hər dəfə onun meyvələrindən onlara ruzi verildikcə: "Bu ki, əvvəlcə bizə verilən ruzidir!"– deyəcəklər Halbuki onlara onun oxşarı veriləcəkdir Onlardan ötrü orada pak zövcələr var və onlar orada əbədi qalacaqlar.

82. İman gətirib yaxşı işlər görənlər isə Cənnət sakinləridir Onlar orada əbədi qalacaqlar!

214. Yoxsa siz elə güman edirdiniz ki, sizdən əvvəlkilərin başına gələnlər sizin başınıza gəlmədən Cənnətə daxil olacaqsınız? Onlara elə kasıblıq və xəstəlik üz vermiş, elə sarsılmışdılar ki, hətta Peyğəmbər və onunla birlikdə olan möminlər də: "Allahın köməyi nə vaxt gələcək?"– dedilər. Həqiqətən, Allahın köməyi yaxındır.

## 3. Ali-İmran

15. De: "Sizə bunlardan daha yaxşısı barədə xəbər verimmi? Allahdan qorxanlar üçün Rəbbi yanında ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları, pak zövcələr və Allahın rizası vardır". Allah qullarını görür.
16. O kəslər ki: "Ey Rəbbimiz! Həqiqətən, biz iman gətirdik, bizim günahlarımızı bağışla və bizi Od əzabından qoru!"– deyirlər;
17. onlar səbir edən, doğru danışan, müti olan, malından Allah yolunda xərcləyən və sübh çağına yaxın bağışlanma diləyən kimsələrdir.

132. Allaha və Peyğəmbərə itaət edin ki, bəlkə sizə rəhm olunsun.
133. Rəbbiniz tərəfindən bağışlanmağa və müttəqilər üçün hazırlanmış, genişliyi göylər və yer qədər olan Cənnətə tələsin.
134. O müttəqilər ki, bolluq zamanı da, qıtlıq zamanı da mallarından Allah yolunda xərcləyir, qəzəblərini boğur və insanları bağışlayırlar. Allah yaxşı iş görənləri sevir.
135. O kəslər ki, bir pis iş gördükdə, yaxud özlərinə zülm etdikdə Allahı xatırlayıb günahlarının bağışlanmasını

diləyərlər, – günahları Allahdan başqa kim bağışlaya bilər? – onlar bilə-bilə etdiklərinə görə israr etməzlər.
136. Onların mükafatı, Rəbbindən bağışlanma və ağacları altından çaylar axan Cənnət bağlarıdır ki, orada əbədi qalacaqlar. Yaxşı əməl sahiblərinin mükafatı necə də gözəldir!

185. Hər bir kəs ölümü dadacaqdır. Lakin Qiyamət günü mükafatlarınız sizə tam veriləcəkdir. Kim Oddan uzaqlaşdırılıb, Cənnətə daxil edilərsə, o uğur qazanmış olar. **Dünya həyatı** isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.

195. Rəbbi onlara belə cavab verdi: "Mən, sizlərdən yaxşı işlər görən – istər kişi, istərsə də qadın olsun, – heç bir kəsin əməyini puç etmərəm. Siz birbirinizdənsiniz. Hicrət edənlərin, öz yurdlarından çıxarılanların, Mənim yolumda əziyyətə düçar olanların, vuruşanların və öldürülənlərin, əlbəttə, təqsirlərindən keçəcək və onları ağacları altından çaylar axan Cənnət bağlarına daxil edəcəyəm. Bu, Allah tərəfindən bir mükafatdır. Gözəl mükafat məhz Allahın dərgahındadır".

198. Öz Rəbbindən qorxanları ağacları altından çaylar axan Cənnət bağları gözləyir ki, onlar orada əbədi qalacaqlar. Bu, Allahdan bir ziyafətdir. Allahın yanında olan nemətlər möminlər üçün daha xeyirlidir.

## 4. ən-Nisa

13. Bunlar Allahın qoyduğu hüdudlarıdır. Kim Allaha və Onun Elçisinə itaət edərsə, Allah onu ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağlarına daxil edər. Bu, böyük uğurdur.

31. Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizdən keçər və sizi şərəfli bir keçidə (Cənnətə) daxil edərik.

57. İman gətirib saleh əməllər işləyənləri isə ağacları altından çaylar axan, içində əbədi məskunlaşacaqları Cənnət bağlarına daxil edəcəyik. Onlar üçün orada pak zövcələr vardır. Biz onları sıx kölgəliklərdə yerləşdirəcəyik.

122. İman gətirib saleh əməllər edənləri isə ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağlarına daxil edəcəyik. Bu, Allahın gerçək vədi sayəsində olacaqdır. Sözündə Allahdan daha doğruçu kim ola bilər?

124. Həm kişilərdən, həm də qadınlardan mömin olaraq yaxşı işlər görənlər Cənnətə girərlər və onlara xurma çərdəyinin qırıntısı qədər haqsızlıq edilməz.
125. Yaxşı işlər görərək Allaha təslim olan və hənif olaraq İbrahim dininin ardınca gedən şəxsdən din baxımından daha gözəl kim ola bilər? Allah İbrahimi sevimli dost tutmuşdur.

## 5. əl-Maidə

12. …Allah dedi: "Mən sizinləyəm. Əgər namaz qılsanız, zəkat versəniz, Mənim elçilərimə inanıb onlara yardım etsəniz və kasıblara könüllü yardım etməklə Allaha gözəl bir borc versəniz, əlbəttə, Mən təqsirlərinizdən keçər və sizi ağacları altından çaylar axan Cənnət bağlarına daxil edərəm. Sizlərdən

kimsə bundan sonra kafir olsa, bilsin ki, artıq o, doğru yoldan azmışdır".

83. Allahın elçisinə nazil ediləni dinlədikləri zaman haqqı bildiklərinə görə onların gözlərinin yaşla dolduğunu görərsən. Onlar deyərlər: "Ey Rəbbimiz! Biz iman gətirdik, bizi də şahidlərlə bir yerə yaz!
84. Nə üçün biz Allaha və bizə gələn haqqa inanmayaq? Biz ki Rəbbimizin bizi əməlisaleh camaatla birlikdə Cənnətə daxil edəcəyinə ümid edirik".
85. Belə dediklərinə görə də Allah onları ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları ilə mükafatlandırdı. Yaxşı iş görənlərin mükafatı budur.

119. Allah dedi: "Bu, doğru danışanlara doğruluqlarının fayda verəcəyi gündür! Onlar üçün ağacları altından çaylar axan və içində əbədi qalacaqları Cənnət bağları hazırlanmışdır". Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Bu, böyük uğurdur.
120. Göylərin, yerin və onların arasında olanların hökmranlığı Allaha məxsusdur və O, hər şeyə qadirdir.

## 7. əl-Əraf

42. İman gətirib yaxşı əməl edənlər isə Cənnət sakinləridir. Onlar orada əbədi qalacaqlar. Biz hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər yükləyirik.
43. Biz onların kökslərindəki kin-küdurəti çıxaracağıq. Onların ayaqları altından çaylar axacaq. Onlar deyəcəklər: "Bizi buna qovuşduran Allaha həmd olsun! Əgər Allah bizə hidayət etməsəydi, biz özümüz doğru yola yönələ bilməzdik. Əlbəttə,

Rəbbimizin elçiləri haqqı gətirmişdilər". Onlara belə xitab ediləcəkdir: "Əməlləriniz sayəsində varis olduğunuz Cənnət budur!"
44. Cənnət əhli Od sakinlərini səsləyib deyəcəklər: "Biz Rəbbimizin bizə vəd etdiyinin doğru olduğunu gördük. Siz də Rəbbimizin sizə vəd etdiyinin doğru olduğunu gördünüzmü?" Onlar: "Bəli!"– deyəcəklər. Bu zaman onların arasında bir carçı səsləyib deyəcəkdir: "Allahın lənəti olsun zalımlara!
45. O kəslərə ki, insanları Allah yolundan sapdırır, onu əyri göstərməyə çalışır və axirəti inkar edirdilər".
50. Od sakinləri Cənnət əhlini səsləyib deyəcəklər: "Bizim üstümüzə bir az su və ya Allahın sizə verdiyi ruzidən tökün". Onlar isə deyəcəklər: "Allah bunları kafirlərə haram etmişdir".
51. O kəslərə ki, dinlərini əyləncə və oyun etmişdilər və **dünya həyatı** onları aldatmışdı. Onlar bu günləri ilə qarşılaşmağı unutduqları və ayələrimizi inkar etdikləri kimi, Biz də onları bu gün unudarıq.

## 9. ət-Tovbə

21. Rəbbi Öz tərəfindən onları bir mərhəmət, razılıq və içərisində onlar üçün tükənməz nemətlər olan Cənnət bağları ilə müjdələyir.
22. Onlar orada əbədi qalacaqlar. Şübhəsiz ki, ən böyük mükafat Allah yanındadır.

71. Mömin kişilərlə mömin qadınlar bir-birinin dostlarıdır. Onlar insanlara yaxşı işlər görməyi buyurur, pis əməllərə qadağa qoyur, namaz qılır, zəkat verir, Allaha və Onun

Elçisinə itaət edirlər. Allah onlara rəhm edəcəkdir. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir.
72. Allah mömin kişilərə və mömin qadınlara ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları və Ədn bağlarında gözəl məskənlər vəd etmişdir. Allahın razılığı isə daha böyükdür. Bu, böyük uğurdur.

88. Lakin Allahın Elçisi və onunla birgə iman gətirənlər malları və canları ilə cihad etdilər. Onlar üçün nemətlər hazırlanmışdır. Məhz onlar uğur qazananlardır.
89. Allah onlar üçün ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.

100. Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Allah onlar üçün ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.

111. Doğrudan da, Allah möminlərdən, Cənnət müqabilində onların canlarını və mallarını satın almışdır. Çünki onlar Allah yolunda vuruşub öldürür və öldürülürlər. Bu, Allahın Tövratda, İncildə və Quranda Öz öhdəsinə götürdüyü bir vəddir. Allahdan daha yaxşı əhdini yerinə yetirən kimdir? Elə isə sövdələşdiyiniz alış-verişə görə sevinin. Məhz bu, böyük uğurdur.

## 10. Yunus

25. Allah əmin-amanlıq yurduna (Cənnətə) çağırır və istədiyini doğru yola yönəldir.

26. Yaxşı iş görənlər üçün ən yaxşısı (Cənnət) və bundan da üstünü (Allahı görmək) vardır. Onların üzünü nə bir qubar, nə də bir zillət bürüyər. Onlar Cənnət sakinləridirlər və orada əbədi qalacaqlar.

## 11. Hud

23. Sözsüz ki, iman gətirib saleh əməllər edənlər və Rəbbinə boyun əyənlər Cənnət sakinləridir. Onlar orada əbədi qalacaqlar.

108. Xoşbəxtlərə gəldikdə isə, onlar Cənnətdə olacaqlar. Rəbbinin dilədiyi istisna olmaqla, göylər və yer durduqca onlar orada əbədi qalacaqlar. Bu, tükənməz bir sovqatdır.

## 13. ər-Rad

18. Rəbbinin dəvətini qəbul edənlər üçün ən gözəl nemət (Cənnət) hazırlanmışdır. Onun dəvətini qəbul etməyənlərə gəlincə, yer üzündə olan var-dövlətin hamısı, üstəlik bir o qədəri də onların olsaydı, əzabdan qurtarmaq üçün onu mütləq fidyə verərdilər. Onlarla dəhşətli bir haqq-hesab çəkiləcəkdir. Onların sığınacaqları yer Cəhənnəmdir. Ora nə pis yataqdır!
19. Rəbbindən sənə nazil edilənin haqq olduğunu bilən kimsə, kora bənzəyə bilərmi? Bundan ancaq ağıl sahibləri ibrət alarlar.
20. O kəslər ki, Allaha verdikləri sözü yerinə yetirir və əhdi pozmurlar.
21. O kəslər ki, Allahın qovuşdurulmasını əmr etdiyi şeyləri qovuşdurur (qohumluq və qardaşlıq əlaqələrini

möhkəmlədir), Rəbbindən qorxur və pis haqq-hesabdan çəkinirlər.

## 14. İbrahim

23. İman gətirib saleh əməllər edənlər isə ağacları altından çaylar axan, Rəbbinin izni ilə içində əbədi qalacaqları Cənnət bağlarına daxil ediləcəklər. Onların orada qarşılaşarkən bir-birinə deyəcəkləri söz: "Salam!" olacaqdır.

## 15. əl-Hicr

45. Sözsüz ki, müttəqilər Cənnət bağlarında və çeşmələr başında olacaqlar.
46. Onlara deyiləcək: "Oraya sağ-salamat və xatircəmliklə daxil olun!"
47. Biz onların köksündəki kin-küdurəti çıxarıb kənar etdik. Onlar taxtlar üzərində qarşı-qarşıya əyləşən qardaşlar olacaqlar.
48. Onlara orada heç bir yorğunluq toxunmayacaq və onlar oradan çıxarılmayacaqlar.
49. Qullarıma xəbər ver ki, Mən Bağışlayanam, Rəhmliyəm.
50. Əzabım isə ağrılı-acılı əzabdır.

## 16. ən-Nəhl

31. Onlar ağacları altından çaylar axan Ədn bağlarına girəcəklər. Orada onların ürəklərinin istədikləri hər şey vardır. Allah müttəqiləri belə mükafatlandırır.

32. O kəslər ki, tər-təmiz olduqları halda, mələklər onların canını alıb deyirlər: "Sizə salam olsun! Əməllərinizə görə Cənnətə girin!"

## 19. Məryəm

60. Ancaq Allaha tövbə edib iman gətirənlər və xeyirxahlıq edənlərdən başqa! Onlar Cənnətə daxil olacaq və heç bir haqsızlığa məruz qalmayacaqlar.
61. Bu Cənnət Mərhəmətli Allahın Öz qullarına vəd etdiyi və onların görmədikləri Ədn bağlarıdır. Onun vədi mütləq yerinə yetəcəkdir.
62. Onlar orada boş sözlər deyil, ancaq: "Salam!" eşidəcəklər. Orada səhəraxşam onların ruzisi olacaqdır.
63. Qullarımızdan olan müttəqilər üçün miras edəcəyimiz Cənnət budur.

## 22. əl-Həcc

14. Allah iman gətirib yaxşı işlər görənləri ağacları altından çaylar axan Cənnət bağlarına daxil edəcək. Şübhəsiz ki, Allah istədiyini edər.

23. Həqiqətən də, Allah iman gətirib yaxşı işlər görənləri ağacları altından çaylar axan Cənnət bağlarına daxil edəcəkdir. Onlar orada qızıl bilərziklərlə və incilərlə bəzədiləcək, libasları da ipəkdən olacaqdır.

## 25. əl-Furqan

75. Onlar səbir etdiklərinə görə Cənnətdə olan yüksək məqamla mükafatlandırılacaq, orada xeyir-dua ilə, salamla qarşılanacaqlar.
76. Onlar orada əbədi qalacaqlar. O, nə gözəl məskən, necə də gözəl iqamətgahdır!

## 28. əl-Qasas

60. Sizə verilən hər şey ancaq **dünya həyatı**nın keçici zövqü və onun bərbəzəyidir. Allah yanında olanlar isə daha xeyirli və daha sürəklidir. Məgər başa düşmürsünüz?
61. Məgər verdiyimiz gözəl bir vədə (Cənnətə) qovuşan kimsə, dünya həyatının keçici zövqünü bəxş etdiyimiz, sonra da qiyamət günü Cəhənnəmə gətiriləcək kimsə ilə eyni ola bilərmi?

## 29. əl-Ənkəbut

57. Hər kəs ölümü dadacaqdır. Sonra da Bizə qaytarılacaqsınız.
58. İman gətirib xeyirxah işlər görənləri ağacları altından çaylar axan Cənnətdəki otaqlarda yerləşdirəcəyik. Onlar əbədi olaraq orada qalacaqlar. Yaxşı əməl sahiblərinin mükafatı necə də gözəldir!
59. O kəslərin ki, səbirli olmuş və yalnız öz Rəbbinə təvəkkül etmişlər.

## 30. ər-Rum

14. Məhz o Saatın gələcəyi gün möminlərlə kafirlər ayrılacaqlar.
15. İman gətirib yaxşı işlər görənlərə gəlincə isə, onlar Cənnət bağçalarında şadlıq içində olacaqlar.
16. Kafir olub ayələrimizi və axirətə düşəcəklərini yalan sayanlar isə əzaba giriftar ediləcəklər.

44. Kim küfr edərsə, küfrü öz əleyhinə olar. Yaxşı iş görənlər isə özləri üçün Cənnətdə yer hazırlamış olarlar.
45. Bu ona görədir ki, Allah iman gətirib yaxşı işlər görənlərə Öz lütfündən mükafat versin. Şübhəsiz ki, O, kafirləri sevmir.

## 34. Səba

37. Sizi bizə yaxınlaşdıra biləcək nə var-dövlətiniz, nə də oğul-uşağınızdır. Ancaq iman gətirib yaxşı işlər görənlər istisnadır. Məhz onların mükafatları etdikləri əməllərə görə qat-qat artırılacaq və onlar Cənnətdəki mənzillərində asudə yaşayacaqlar.

## 36. Ya sin

53. Bircə dəhşətli səs qopan kimi onların hamısı hüzurumuza gətiriləcəklər.
54. Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Sizə ancaq etdiyiniz əməllərin əvəzi veriləcəkdir.
55. Həqiqətən də Cənnət əhli həmin gün nemətlər içində kef çəkəcək.
56. Onlar zövcələri ilə birlikdə kölgəliklərdə taxtlara söykənəcəklər.
57. Orada onlar üçün meyvələr və istədikləri hər şey vardır.

58. Üstəlik Rəhmli Rəbb onlara: "Salam" deyəcək.

## 37. əs-Saffat

40. Lakin Allahın seçilmiş ixlaslı qulları müstəsnadırlar.
41. Məhz onlar üçün müəyyən bir ruzi vardır –
42. Cənnət meyvələri. Onlara ehtiram göstəriləcəkdir –
43. Nəim bağlarında.
44. Onlar taxtlar üstündə bir-biri ilə üzbəüz oturacaqlar.
45. Onlar üçün çeşmə şərabı ilə dolu piyalələr dolandırılacaqdır.
46. Özü də ağappaq, içənlərə ləzzət verən bir şərab.
47. O şərab nə baş ağrısı verər, nə də ondan məst olarlar.
48. Onların yanında baxışları öz ərlərinə dikilmiş iri qaragözlü hurilər olacaqdır.
49. Özü də qorunub saxlanılmış yumurta kimi hurilər.

## 38. Sad

49. Bu, bir xatırlatmadır. Allahdan qorxanları gözəl bir qayıdış yeri gözləyir –
50. qapıları onlar üçün açılmış Ədn bağları.
51. Onlar orada taxtlara dirsəklənib çoxlu-çoxlu meyvələr və cənnətə məxsus içkilər istəyəcəklər.
52. Onların yanında gözlərini ərindən çəkməyən həmyaşıdları olacaqdır.
53. Hesablaşma günü üçün sizə vəd olunanlar bunlardır.
54. Bəli, bu Bizim verdiyimiz nemətdir. O, tükənməzdir.

## 39. əz-Zumər

10. Qullarıma Mənim bu Sözümü de: "Ey Mənim iman gətirən qullarım! Rəbbinizdən qorxun! Bu dünyada yaxşılıq edənləri yaxşılıq (Cənnət) gözləyir. Allahın yaratdığı yer üzü genişdir. Yalnız səbir edənlərə mükafatları hesabsız veriləcəkdir".

73. Rəbbindən qorxanlar da dəstə-dəstə Cənnətə gətiriləcəklər. Nəhayət, ora çatdıqda onun qapıları açılacaq və onun gözətçiləri onlara deyəcəklər: "Sizə salam olsun! Xoş sizin halınıza! Əbədi qalmaq üçün buraya daxil olun!"
74. Onlar deyəcəklər: "Bizə verdiyi vədini yerinə yetirən və bizi bu yerə varis edən Allaha həmd olsun! Biz Cənnətin istədiyimiz yerində sakin oluruq. Yaxşı əməl sahiblərinin mükafatı necə də gözəldir!"

## 40. Ğafir

39. Ey qövmüm! Bu **dünya həyatı** ancaq fani bir zövqdür, axirət isə qərar tutacağınız yurddur.
40. Kim pis bir iş tutsa, o ancaq işinin həddi qədər cəza alar. Mömin olmaqla bərabər, yaxşı iş görən kişilər və qadınlar Cənnətə daxil olub orada hesabsız ruziyə nail olarlar.

## 42. əş-Şura

22. Zalımların qazandıqları günahlar özlərinə qarşı çevrildikdə onları bunun qorxusundan titrəyən görəcəksən. İman gətirib yaxşı işlər görənlər isə Cənnət bağçalarında məskunlaşacaqlar. Rəbbinin yanında onlar üçün istədikləri hər şey hazırlanmışdır. Böyük lütfkarlıq da elə budur.

## 43. əz-Zuxruf

68. Ey qullarım! Həmin gün sizə qorxu yoxdur və siz heç kədərlənməyəcəksiniz də.
69. Siz ayələrimizə iman gətirib müsəlman olmusunuz.
70. Siz də, zövcələriniz də fərəhlə Cənnətə daxil olun!
71. Onlar üçün qızıl sinilər və piyalələr dolandırılacaqdır. Orada nəfslərin istədiyi və gözlərə xoş gələn hər şey olacaqdır. Siz orada əbədi qalacaqsınız.
72. Xeyirxah əməllərinizin nəticəsi kimi varis olduğunuz Cənnət budur.
73. Orada sizin üçün bol-bol meyvələr vardır, onlardan yeyəcəksiniz.

## 46. əl-Əhqaf

13. Həqiqətən də: "Rəbbimiz Allahdır!"– deyib sonra düz yol tutanlara heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.
14. Onlar Cənnət əhlidirlər və etdikləri əməllərin əvəzi olaraq orada əbədi qalacaqlar.
15. Biz insana ata-anasının qayğısına qalmağı tövsiyə etdik. Anası onu bətnində əziyyətlə daşımış və əziyyətlə doğmuşdur. Onun bətndə daşınma və süddən kəsilmə müddəti otuz ay çəkir. Nəhayət, o, yetkinlik çağına yetişib qırx yaşa çatdıqda deyər: "Ey Rəbbim! Mənə, mənim özümə və valideynlərimə bəxş etdiyin nemətə şükür etmək və Sənin razı qalacağın yaxşı işlər görmək üçün ilham ver, nəslimi də mənim üçün əməlisaleh et. Mən Sənə tövbə etdim. Həqiqətən, mən müsəlmanlardanam!"

16. Beləlləri, əməllərinin ən yaxşısını qəbul edəcəyimiz, günahlarından keçəcəyimiz və Cənnət əhli içərisinə daxil edəcəyimiz kimsələrdir. Bu onlara verilmiş doğru vəddir.

## 47. Muhəmməd

5. Allah onları doğru yola yönəldəcək, onların halını yaxşılaşdıracaq
6. və onları özlərinə tanıtmış olduğu Cənnətə daxil edəcəkdir.
7. Ey iman gətirənlər! Əgər siz Allaha (Onun dininə) kömək göstərsəniz, O da sizə kömək göstərər və ayaqlarınızı möhkəmlədər.

12. Allah iman gətirib yaxşı işlər görənləri ağacları altından çaylar axan Cənnət bağlarında yerləşdirər edər. Kafirlər isə müvəqqəti olaraq kef çəkər, heyvan kimi yeyib-içərlər. Onların yeri Oddur!

## 48. əl-Fəth

4. Möminlərin imanı üstünə iman artırmaq üçün onların qəlbinə rahatlıq göndərən Odur. Göylərin və yerin orduları Allahındır. Allah Biləndir, Müdrikdir.
5. Bu ona görədir ki, Allah mömin kişiləri və mömin qadınları içində əbədi qalacaqları, ağacları altından çaylar axan Cənnət bağlarına daxil etsin və onların günahlarından keçsin. Bu, Allah yanında böyük müvəffəqiyyətdir.

## 50. Qaf

31. Cənnət müttəqilərə yaxınlaşdırılacaq, onlardan uzaqda olmayacaqdır.
32. Budur sizə vəd edilən Cənnət! O, hər bir tövbə edib Allaha üz tutan, Onun əmrinə riayət edən,
33. Mərhəmətli Allahdan Onu görmədən qorxan və Allaha yönəlmiş qəlblə gələn kimsələr üçündür.
34. Ora sağ-salamat daxil olun! Bu, Əbədiyyət günüdür.
35. Orada onlar üçün istədikləri hər şey hazırlanmışdır. Üstəlik hüzurumuzda bundan da artığı (Allahı görmək) vardır.

## 51. əz-Zəriyət

15. Şübhəsiz ki, müttəqilər Cənnət bağlarında və bulaqlar başında olacaqlar,
16. öz Rəbbinin onlara verdiyini alacaqlar. Həqiqətən, onlar bundan əvvəl yaxşı iş görən adamlar olmuşdular.
17. Onlar gecələr ibadət edib az yatırdılar.
18. Sübh çağı isə bağışlanma diləyirdilər.
19. Onların mal-dövlətində dilənçinin və yoxsulun payı vardır.

## 52. ət-Tur

17. Şübhəsiz ki, müttəqilər Cənnət bağlarında və nemət içində yaşayacaqlar.
18. Rəbbinin onlara bəxş etdiyinə sevinəcəklər. Rəbbi onları Cəhənnəm əzabından xilas etmişdir.
19. Onlara deyiləcək: "Xeyirxah əməllərinizin əvəzi olaraq nuşcanlıqla yeyin, için!"
20. Onlar səflərlə salınmış mütəkkələrə dirsəklənəcəklər. Biz onları iri qaragözlü hurilərlə evləndirəcəyik.

21. Möminlərin imanda onların arxasınca gedən nəsillərini də Cənnətdə özlərinə qovuşduracağıq. Onların əməllərindən heç bir şey əskiltməyəcəyik. Hər kəs qazandığının girovudur.
22. Onlara istədikləri meyvədən və ətdən bol-bol verəcəyik.
23. Onlar orada bir-birinə şərab dolu badə uzadacaqlar. Bu şərab onları nə boşboğazlığa, nə də günaha təhrik etməz.
24. Onların ətrafında xidmətlərinə verilmiş, qorunub saxlanılan mirvari kimi cavan oğlanlar dolanacaqlar.
25. Onlar bir-birinə üz tutub soruşacaqlar.
26. Onlar deyəcəklər: "Biz əvvəllər ailəmiz içində olarkən Allahdan qorxurduq.
27. Allah da bizə mərhəmət göstərdi və bizi qızmar yel əzabından qorudu.
28. Biz əvvəllər Ona dua edirdik. Həqiqətən, O, yaxşılıq edəndir, Rəhmlidir!"

## 54. əl-Qamər

52. Onların etdiyi hər şey əməllərinin yazıldığı kitablarındadır.
53. Hər bir kiçik və böyük əməl yazılmışdır.
54. Şübhəsiz ki, müttəqilər Cənnət bağlarında və çaylar kənarında,
55. qadir Hökmdarın hüzurundakı haqq məclisində olacaqlar!

## 55. ər-Rahmən

6. Rəbbinin hüzurunda durmaqdan qorxanları iki Cənnət bağı gözləyir.
47. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
48. İkisində də növbənöv meyvələrlə dolu budaqlar vardır.
49. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

50. İkisində də iki axar bulaq vardır.
51. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
52. İkisində də hər meyvədən qoşa-qoşa vardır.
53. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
54. Onlar orada astarları atlazdan olan döşəklərə dirsəklənəcəklər. Hər iki bağın meyvələri onlara yaxın olacaqdır.
55. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
56. Orada gözlərini öz ərlərinə dikmiş, onlardan əvvəl özlərinə heç bir insan və cin toxunmamış qızlar vardır.
57. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
58. Onlar sanki yaqut və mərcandırlar.
59. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
60. Yaxşılığın əvəzi ancaq yaxşılıq deyildirmi?
61. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
62. Bu ikisindən başqa daha iki Cənnət bağı da vardır.
63. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
64. Hər ikisi tünd yaşıldır.
65. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
66. İkisində də fəvvarə vuran iki bulaq vardır.
67. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
68. İkisində də cürbəcür meyvələr, xurma ağacları və nar vardır.
69. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
70. Orada xoş xasiyyətli, gözəl qızlar vardır.
71. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
72. Çadırlarda gözlərini öz ərlərinə dikmiş hurilər vardır.
73. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
74. Onlardan əvvəl özlərinə heç bir insan və cin toxunmamış qızlar vardır.
75. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
76. Onlar yaşıl balışlara və gözəl döşəkcələrə dirsəklənəcəklər.

77. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?
78. Sənin əzəmət və kərəm sahibi olan Rəbbinin adı nə qədər mübarəkdir.

## 56. əl-Vaqiə

10. Xeyirxah işlərdə öndə gedənlər, Cənnətdə də öndədirlər!
11. Onlar Allaha yaxın olanlar,
12. Nəim bağlarında qalacaq kimsələrdir.
13. Onların çoxu əvvəlki nəsillərdən,
14. az bir qismi də axırıncılardandır.
15. Onlar bəzənmiş taxtlar üstündə
16. qarşı-qarşıya əyləşib dirsəklənəcəklər.
17. Onların ətrafında həmişəcavan xidmətçi oğlanlar fırlanacaqlar;
18. çeşmə şərabı ilə dolu badələr, bardaqlar və qədəhlərlə –
19. ondan başları ağrımaz və məst olmazlar,
20. bəyənib seçdikləri meyvələr
21. və istədikləri quş əti ilə fırlanacaqlar.
22. Onları iri qaragözlü hurilər gözləyir –
23. sədəf içində saxlanılmış mirvariyə bənzər hurilər.
24. Bu, onların etdikləri əməllərin mükafatı olacaq.
25. Onlar orada nə boş söz, nə də günaha səbəb olan söhbət eşidəcəklər.
26. Ancaq: "Salam! Salam!"– sözləri eşidəcəklər.
27. Sağ tərəf sahibləri. Nə xoşbəxtdir sağ tərəf sahibləri!
28. Onlar tikansız sidr ağacları arasında,
29. meyvələri salxım-salxım asılmış banan ağacları altında,
30. uzanmış kölgəliklərdə,
31. daim axan sular kənarında,
32. çoxlu meyvələr,

33. tükənməz və qadağan edilməyən meyvələr içində
34. və hündür döşəklər üstündə olacaqlar.
35. Biz Cənnətdəki qadınları yeni biçimdə yaradacağıq.
36. Onları bakirə qızlar edəcəyik –
37. ərlərini sevən, həmyaşıdlar.
38. Bunlar sağ tərəf sahibləri üçündür.
39. Onların çoxu əvvəlki nəsillərdən,
40. bir qismi də axırıncılardandır.

## 57. əl-Hədid

11. Kimdir o şəxs ki, Allaha gözəl bir borc versin (Allah yolunda malını yaxşı işlərə sərf etsin), O da onun üçün bunu qat-qat artırsın? Onun üçün çox dəyərli bir mükafat da vardır.
12. O gün sən mömin kişilərin və mömin qadınların nurunun onların önlərindən və sağ tərəflərindən yayıldığını görəcəksən. Onlara: "Bu gün sizin müjdəniz ağacları altından çaylar axan Cənnət bağlarıdır. Siz orada əbədi qalacaqsınız!"– deyiləcək. Bu, böyük uğurdur.

21. Rəbbiniz tərəfindən bağışlanmağa və genişliyi göyün və yerin genişliyi qədər olan, Allaha və Onun elçilərinə iman gətirənlər üçün hazırlanmış Cənnətə tələsin. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah böyük lütf sahibidir.

## 58. əl-Mucadilə

22. Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə

– dostluq etsinlər. Allah onların qəlbinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir. Allah onları ağacları altından çaylar axan Cənnət bağlarına daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidirlər. Həqiqətən, məhz Allahın firqəsi nicat tapanlardır.

## 59. əl-Həşr

19. Allahı unudan, buna görə də Allahın onları özlərinə unutdurduğu kəslər kimi olmayın! Onlar fasiqlərdir.
20. Cəhənnəm əhli ilə Cənnət əhli eyni deyillər. Cənnət əhli uğur qazananlardır.
21. Əgər Biz bu Quranı dağa nazil etsəydik, sən onun Allahın qorxusundan boyun əyib parça-parça olduğunu görərdin. Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, fikirləşələr.

## 61. əs-Saff

11. Allaha və Onun Elçisinə iman gətirin, Allah yolunda malınız və canınızla cihad edin. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir.
12. Bu təqdirdə O sizin günahlarınızı bağışlayar və sizi ağacları altından çaylar axan Cənnət bağlarına və Ədn bağlarındakı gözəl məskənlərə daxil edər. Bu, böyük müvəffəqiyyətdir.
13. Sevdiyiniz başqa şey də vardır: Allah tərəfindən kömək və yaxın qələbə. Möminləri bununla müjdələ.

## 64. əl-Təğabun

8. Elə isə Allaha, Onun Elçisinə və nazil etdiyimiz Nura (Qurana) iman gətirin! Allah nə etdiklərinizdən xəbərdardır.
9. O gün Allah sizi Toplanma gününə cəm edəcək. Həmin gün qarşılıqlı aldanma günüdür. Hər kəs Allaha iman gətirib yaxşı işlər görsə, Allah onun günahlarını bağışlayar və onu ağacları altından çaylar axan Cənnət bağlarına daxil edər. Onlar orada əbədi qalacaqlar. Bu, böyük müvəffəqiyyətdir.

## 65. ət-Talaq

10. … Ey iman gətirmiş ağıl sahibləri, Allahdan qorxun! Allah sizə zikr nazil etmiş,
11. və iman gətirib yaxşı işlər görənləri zülmətlərdən nura çıxartmaq üçün Allahın aydın ayələrini sizə oxuyan bir elçi göndərmişdir. Hər kəs Allaha iman gətirib saleh əməl işləsə, Allah onu içində əbədi qalacağı ağacları altından çaylar axan Cənnət bağlarına daxil edər. Allah ona gözəl ruzi nəsib etmişdir.

## 66. ət-Təhrim

8. Ey iman gətirənlər! Allaha səmimi olaraq tövbə edin. Ola bilsin ki, Rəbbiniz günahlarınızdan keçsin və sizi, Allah o Peyğəmbəri və onunla birlikdə iman gətirənləri utandırmayacağı gündə, ağacları altından çaylar axan Cənnət bağlarına daxil etsin. Onların nuru önlərindən və sağ tərəflərindən ətrafa yayılacaqdır. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Nurumuzu bizim üçün tamamla və bizi bağışla. Həqiqətən, Sən hər şeyə qadirsən!"

11. Allah iman gətirənlərə isə Fironun zövcəsini misal çəkdi. O zaman o: "Ey Rəbbim! Mənə Öz yanında – Cənnətdə bir ev tik. Məni Firondan və onun əməlindən xilas et. Məni zalım adamlardan qurtar!"– demişdi.

## 69. əl-Həqqa

19. Kitabı sağ əlinə verilən deyəcəkdir: "Budur, oxuyun kitabımı!
20. Mən bilirdim ki, etdiklərimin hesabına qovuşacağam".
21. O, xoşbəxt həyat sürəcəkdir
22. uca bir Cənnətdə,
23. elə bir Cənnətdə ki, onun meyvələri lap yaxınlıqda olacaqdır.
24. Onlara: "Keçmiş günlərdə etdiyiniz əməllərə görə nuşcanlıqla yeyin-için!"–deyiləcəkdir.

## 70. əl-Məaric

32. O kəslər ki, əmanəti danmır və əhdlərini pozmurlar.
33. O kəslər ki, şahidliklərində mətindirlər.
34. Bir də o kəslər ki, namazlarını dəqiqliklə qılırlar.
35. Cənnət bağlarında hörmət göstəriləcək insanlar da elə onlar olacaqdır.

## 74. əl-Muddəssir

40. Onlar Cənnət bağlarında bir-birlərindən soruşacaqlar –
41. günahkarlar barəsində.
42. Sizi Səqərə salan nədir?

43. Onlar deyəcəklər: "Biz namaz qılanlardan deyildik.
44. Kasıbı da yedizdirməzdik.
45. Batil sözlər danışanlarla birlikdə biz də danışardıq,
46. və Haqq-hesab gününü yalan hesab edərdik –
47. ölüm yəqinliyi bizə gələnə qədər".

## 76. əl-İnsan

5. Sözsüz ki, itaətkarlar kafur qatılmış şərabla dolu badələrdən nuş edəcəklər.
6. Bu elə bir bulaqdır ki, Allahın qulları ondan doyunca içər və onun mənsəbini istədikləri səmtə yönəldərlər.
7. Onlar vəd etdikləri nəziri verər və vəhşəti hər yeri sarsıdacaq Gündən qorxarlar.
8. Onlar özlərinin istədikləri şeylərdən kasıba, yetimə və əsirə də verərlər
9. və deyərlər: "Biz sizi yalnız Allahın Üzü xatirinə yedirdirik və sizdən nə əvəzini, nə də minnətdarlıq gözləmirik!
10. Əslində, biz, Rəbbimizdən gələ bilən çox kəskin və ağır bir gündən ehtiyat edirik!"
11. Bunun əvəzində Allah da onları həmin günün şərindən qoruyar və onlara gözəllik və sevinc nəsib edər
12. və onlara səbir etdiklərinə görə Cənnəti bəxş edər və orada geyəcəkləri ipəklə mükafatlandırar.
13. Onlar orada taxtlar üzərində mütəkkələrə dirsəklənəcək və orada nə günəş, nə də şaxta görməyəcəklər.
14. Cənnət ağaclarının kölgələri özləri onlara yaxınlaşacaq, meyvələri də tam onların ixtiyarına veriləcək.
15. Onların ətrafına təamlarla dolu gümüşdən hazırlanmış qablar və büllur qədəhlər dolandırılacaq.

16. Gümüşdən olan elə büllur qədəhlər ki, xidmətçilər onları cənnətdəkilərin içmək istədikləri həcmdə hazırlamışlar.
17. Orada onlara zəncəfil qatılmış şərab badəsi içirdiləcək.
18. Bu elə bir bulaqdandır ki, o, Cənnətdə Səlsəbil adlanır.
19. Onların ətrafında həmişə gənc olan xidmətçi cavanlar dolanacaqlar. Onları gördükdə səpələnmiş mirvari dənələri olduqlarını sanarsan.
20. Cənnətdə hara baxsan nemət və əzəmətli səltənət nişanəsi görərsən.
21. Onlar əyinlərinə taftadan və atlazdan yaşıl paltarlar geyəcəklər. Onların qoluna gümüş bilərziklər bağlanacaq. Onların Rəbbi onlara tərtəmiz şərab içirdəcəkdir.
22. Onlara deyiləcəkdir: "Həqiqətən, bu sizə bir hədiyyədir və səyiniz təşəkkürə layiqdir".

## 79. ən-Nəziət

40. Ancaq kim Rəbbinin hüzuruna gələcəyindən qorxmuş və nəfsinə pis işləri qadağan etmişsə,
41. həqiqətən, Cənnət onun məskəni olacaq.

## 81. ət-Təkvir

12. Cəhənnəm alovlandırılacağı zaman
13. və Cənnət möminlərə yaxınlaşdırılacağı zaman,
14. hər kəs bu gün üçün özünə nə tədarük etdiyini biləcəkdir.

## 85. əl-Buruc

11. Şübhəsiz ki, iman gətirib yaxşı işlər görənlər üçün ağacları altından çaylar axan Cənnət bağları vardır. Bu, böyük müvəffəqiyyətdir.

## 88. əl-Ğaşiyə

8. O gün neçəsinin üzündə fərəh görünəcək,
9. dünyadakı səylərindən məmnun qalacaq,
10. uca Cənnətdə olacaq,
11. orada faydasız söz eşitməyəcəkdir.
12. Orada axar çeşmələr vardır;
13. Orada hündür taxtlar,
14. düzülmüş piyalələr,
15. yan-yana qoyulmuş yastıqlar,
16. və döşəmələrə sərilmiş xalçalar vardır.

# Yaradılış səbəbi – Tevhid



Yuxarıdakı ayələri oxuduqdan sonra ağıl sahibi hər kəs dünya həyatının boş olduğunu, nə qədər sərvəti olursa olsun hər şeyin bir gün bitəcəyini, ölümdən qaçış olmadığını başa düşmüş olmalıdır. Yeganə qurtuluş yolunun Allaha təslimiyyətlə keçən həyatda olduğunu, müsəlman kimi yaşayıb müsəlman kimi ölməyin vacibliyini anlamış olmalıdır. Bu hissədə ayələr işığında şirkin (Allaha (c.c.) ortaq qoşmağın) nə olduğunu, bir insanın şirkdən necə uzaq qala biləcəyini, necə etsə həqiqi müsəlman olacağını və cəhənnəmdən qurtulub cənnəti qazana biləcəyini bacardığım qədər izah etməyə çalışdım.

**İlk öncə onu vurğulamaq istiyirəm ki yer üzündə mövcud olma səbəbimiz tək olan Allaha ibadət etməkdir. Qalan hər şey (yaşamaq üçün zəruri ehtiyaclar: yatmaq, yemək-içmək, işləmək və s.) Allaha ibadətimizi rahatlaşdırmaq üçündür və ikinci planda olmalıdır. Yəni, bu şeylər heç vaxt həyatın tək qayəsi olmalı deyil. Bizim üçün dünya həyatı ancaq axirəti qazanmaq üçün bir vasitə olmalıdır, necə ki uzun bir yola çıxdığımız zaman əvvəlcədən tədarük görüb bizə yol üçün lazım olacaq bütün şeyləri götürürüksə eləcədə dünyadan bizim üçün axirətdə lazım olacaq çoxlu saleh əməli (etdiyimiz zaman savab yazılan əməllər) özümüzlə aparmağa çalışmalıyıq, çünki dünyadan axirətə apara biləcəyimiz tək şey saleh əməldir. Allah (c.c.) belə buyurur:**

## 51. əz-Zəriyət

56. Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım.
57. Mən onlardan ruzi istəmirəm. Mən onlardan Məni yedirtmələrini də istəmirəm.
58. Həqiqətən, Allah ruzi verəndir, qüvvət sahibidir, Mətindir.

**Başqa bir ayədə də Allah peyğəmbərimizə belə deməsini əmr edir:**

## 6. əl-Ənam

162. De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, **həyatım da, ölümüm də** aləmlərin Rəbbi Allah üçündür!
163. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanların birincisiyəm".

**Yuxarıdakı ayələrə əsasən deyə bilərik ki, insanın yaradılış qayəsi Allahı qulluq və ibadətdə birləməkdir. Şirkin əksi olan bu, tevhid adlanır. Tevhid birinin dua, namaz, oruc, qurban kimi ibadətlərini yalnız Allah üçün etməsi və bir bütün olaraq həyatını Allahın şəriətinə görə qurması, yalnızca onun qayda və qanunlarına boyun əyməsidir.**

**Bir insanın cəhənnəmdən qurtulub cənnətə girə bilməsi üçün ən əsas amil yalnız Allaha (c.c.) ibadət etməsi və heç bir şeyi Ona (c.c.) ortaq qoşmamasıdır. Bunun üçün də hər bir kəs şirki bilməli və şirkə düşməkdən vəhşi heyvandan qaçdığı kimi qaçmalıdır. Kitabın qalan hissəsində insanlıq mövcud olduğu müddətcə insanların ən çox düşdüyü şirk nümunələri Allahın kitabından ayələrlə göstərilmişdir.**

# Duada Allaha şərik qoşmaqla əlaqəli ayələr



## 40. Ğafir

60. Rəbbiniz dedi: “Mənə dua edin, Mən də sizə cavab verim. Şübhəsiz ki, Mənə ibadət etməkdə təkəbbür göstərənlər Cəhənnəmə müti/zəlil olaraq daxil olacaqlar.”

*Numan b. Bəşirin (r.a) rəvayət etdiyi hədisdə Allah Rəsulu (s.ə.s.): “Dua ibadətdir” dedi və yuxarıdakı ayəni oxudu. (Əbu Davud, 1479; Tirmizi, 2969)*

## 72. əl-Cinn

20. De: "Mən yalnız öz Rəbbimə dua edirəm və kimisə Ona şərik qoşmuram!"

## 39. əz-Zumər

3. Doğrusu, əsl din ancaq Allaha məxsusdur. Allahı qoyub başqalarını özlərinə dost tutanlar: "Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik"– deyirlər. Əlbəttə ki, Allah ziddiyyətə düşdükləri şeylər barəsində onların arasında Öz hökmünü verəcəkdir. Şübhəsiz ki, Allah yalançı və kafirləri doğru yola yönəltməz.

*Şirkin təməlində "uzaq Allah" və "qüsurlu insan" təsəvvürü vardır. "Biz kimik ki birbaşa Allaha dua edək?", "Günahlarımız o qədər çoxdur, bu kirli ağızlarımızla Allahı necə çağıraq?". Bu batil düşüncə insanı Allaha yaxınlaşmaq üçün "vasitələr" axtarmağa sövq edir… Bu ayədən ap açıq görsənir ki məkkəli müşriklər Allaha inanırdılar və indiki müşriklər kimi nəsə bir problemləri olanda Allahla aralarında vasitə olacaq birilərini axtarırdılar. Bu da çox zaman ölüb getmiş saleh insanlar olurdu…(indiki müşriklərin ölmüş imamlarını, şeyxlərini Allahla özləri arasında vasitələr etdiyi kimi)*

## 35. Fatir

13. O, gecəni gündüzə, gündüzü də gecəyə qatır. O, günəşi və ayı ram etmişdir. Onların hər biri müəyyən olunmuş vaxtadək hərəkət edir. Bu sizin Rəbbiniz olan Allahdır. Mülk Onundur. Sizin Ondan başqa yalvardıqlarınız xurma çəyirdəyinin pərdəsinə belə sahib deyillər.
14. Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər. Özləri də Qiyamət günü sizin onlara ibadət etdiyinizi danacaqlar. Heç kəs hər şeydən Xəbərdar olan Allah kimi sənə xəbər verə bilməz.

## 13. ər-Rad

13. Göy gurultusu həmd edərək Ona təriflər deyir. Mələklər də Onun qorxusundan təriflər deyirlər. Allah ildırımlar göndərib istədiyini vurur. Onlar Allah barəsində mübahisə edirlər. Halbuki O, şiddətli cəza verəndir.
14. Haqq dua yalnız Ona ediləndir. Müşriklərin Ondan başqa çağırdıqları isə, onlara heç bir şeylə cavab vermirlər. Onlar ağzına su çatsın deyə uzaqdan iki ovcunu suya açan kimsəyə bənzəyirlər. Halbuki o kimsə suyu ovuclayıb içməyincə su onun ağzına çatan deyildir. Doğrusu, kafirlərin duası azğınlıqdan başqa bir şey deyildir.

## 46. əl-Əhqaf

5. Allahı qoyub Qiyamət gününədək özünə cavab verə bilməyəcək şeylərə yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki o dua etdikləri onların yalvarışından xəbərsizdirlər.
6. İnsanlar bir yerə toplanılacaqları zaman o dua etdikləri onlara düşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər.

## 39. əz-Zumər

43. Yoxsa onlar Allahdan qeyrilərinimi özlərinə şəfaətçi etdilər? De: "Əgər onlar heç bir şeyə malik deyillərsə və heç bir şey anlamırlarsa bəs necə olsun?"

44. De: "Şəfaət bütünlüklə Allaha məxsusdur. Göylərin və yerin hökmranlığı da Ona məxsusdur. Sonra siz Ona qaytarılacaqsınız".

## 6. əl-Ənam

94. Hüzurumuza ilk dəfə sizi xəlq etdiyimiz kimi tək-tənha, həm də sizə verdiyimiz nemətləri arxanızda qoyub gəldiniz. Öz aranızda Allaha şərik saydığınız şəfaətçilərinizi də yanınızda görmürük. Artıq aranızda əlaqə qırılmış, iddia etdiyiniz məbudlar isə sizdən uzaqlaşmışdır.

## 10. Yunus

18. Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilənlərə ibadət edir və: "Onlar Allah yanında bizim şəfaətçilərimizdir!"– deyirlər. De: "Yoxsa Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz?" Allah onların qoşduqları şəriklərdən uzaqdır və ucadır.

## 19. Məryəm

87. Mərhəmətli Allahdan əhd almış kəslərdən başqaları şəfaət etməyə qadir olmazlar.

## 22. əl-Həcc

12. O, Allahı tərk edərək özünə nə zərər, nə də xeyir verə bilməyənə yalvarır. Dərin azğınlıq da elə budur

## 25. əl-Furqan

3. Kafirlər isə Onun əvəzinə heç nəyə fayda verməyən, həm də özləri yaradılan, özlərinə nə bir zərər, nə də bir xeyir verməyə qadir olmayan, öldürməyə, həyat verməyə və yenidən diriltməyə qüdrəti olmayanları özlərinə məbud götürdülər.

## 39. əz-Zumər

38. Əgər sən onlardan: "Göyləri və yeri kim yaratmışdır?"– deyə soruşsan, onlar mütləq: "Allah!"– deyəcəklər. De: "Bir deyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan başqa ibadət etdikləriniz Onun zərərini aradan qaldıra bilərlərmi? Ya da O mənə bir mərhəmət göstərmək istəsə, onlar Onun mərhəmətinin qarşısını ala bilərlərmi?" De: "Mənə Allah yetər. Təvəkkül edənlər yalnız Ona təvəkkül edirlər!"

## 5. əl-Maidə

76. De: "Allahı qoyub sizə nə bir zərər, nə də bir fayda verə bilməyən şeylərəmi ibadət edirsiniz?" Allah Eşidəndir, Biləndir.

## 48. əl-Fəth

***11. ...De: "Əgər Allah sizə bir zərər yetirmək və ya bir xeyir vermək istəsə, Onun edəcəyi işin qarşısını kim ala bilər?" Xeyr, Allah sizin nə etdiyinizdən xəbərdardır.***

## 6. əl-Ənam

*17. Əgər Allah sənə bir zərər vurmaq istəsə, bunun qarşısını Ondan başqa heç kəs ala bilməz. Əgər sənə bir xeyir toxundursa, heç kəs Ona mane ola bilməz. O, hər şeyə qadirdir.*

**Günümüzdə insanların əksəriyyətinin dini, adı "islam" özü isə (islamdan donuz və içkinin haramlığından başqa bir şey qalmayan) ata baba dinidir. Bir çoxlarımızın ətrafında bir çətinliyə düşdükdə, xəstələndikdə, uşaqları olmayanda və s. hallarda ölmüş insanların qəbirlərinə (pirlərə, ziyarətlərə və s.) gedən, öz ehtiyaclarını Allahdan deyil qəbirdə yatan ölülərdən istəyənlər vardır. Onlar elə inanırlar ki qəbirdə yatan ölülər onların ehtiaclarını Allaha çatdıracaq və Allah da o qəbirdəki insanın xətrinə onların ehtiyaclarını qarşılayacaq. Sanki Allahın (c.c.) bir kimsəyə fayda və ya zərər vermək istədikdə bir başqasından icazə almağa ehtiyacı var. Allahdan başqa kim istəyir olsun, Muhəmməd peyğəmbər (s.ə.s) belə olsa və bir kimsə onun qəbrinə gedib ehtiyacını ona ərz eləsə o Allaha şərik qoşan müşrik olmuş olur. Bundan başqa bəzi insanlar ölmüş və ya diri imamlarının, şeyxlərinin qiyamət günü özlərinə şəfaətçi olacaqlarına, Allahdan özlərinin günahlarını bağışlanmasını istəyəcəklərinə inanırlar. Halbuki Allah ayətlərdə şəfaətin yalnız Özünün mülkü olduğunu, yalnız Özünün icazə verdiklərinin, yalnız Özünün razı qaldıqlarına şəfaət edəcəklərini bildirmişdir. Allahdan qeyrisinə şəfaət mövzusunda sığınmaq, Allahın haqqında heç bir dəlil endirmədiyi şəxslərin şəfaət edəcəyinə inanaraq onlardan qiyamət gününün şəfaətini istəmək Allaha ortaq qoşmaq və müşrik olmaqdır.**

# Hökmdə Allaha şərik qoşmaqla əlaqəli ayələr



## 9. ət-Tovbə

31. Onlar Allahı qoyub baş keşişlərini və rahiblərini, bir də Məryəm oğlu İsanı tanrılar qəbul etdilər. Halbuki onlara ancaq tək olan İlaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa tanrı yoxdur. O, bunların şərik qoşduqları şeylərdən uzaqdır.

*"(…)Adiy Mədinəyə gəldi. O, Tay qəbiləsinin başçısı idi. Boynunda gümüş bir xaçla Rəsulullahın (sav) hüzuruna daxil oldu. Rəsulullah (sav) Tövbə surəsinin 31-ci ayəsini oxuyurdu. Adiy Peyğəmbərə (sav): "Xristianlar din adamlarına ibadət etmədilər axı!" dedi. Rəsulullah (sav): "Bəli, amma din adamları onlara Allahın halal etdiyini haram, haram etdiyini də halal etdilər. Onlar da din*

*adamlarına tabe oldular. Bu, onların din adamlarına ibadətidir" buyurdu" (Tirmizi, 3095; İbn Əbi Hatim, 10057-10058)*

- *Ayə və Peyğəmbərimizin (sav) ayəni təfsiri göstərir ki halal-haram, qadağan-icazəli, qanuni-qanunsuz olan şeyləri təyin edən yeganə varlıq Allahdır. Bunun səbəbi Onun "Ər-Rəbb" olmasıdır. Rəbb – tərbiyə edən, intizam verən, təşkil edən, idarə edən deməkdir. Allah qoyduğu qanunlarla insanları tərbiyə edər, cəmiyyətlərə nizam verər.*
- *Bir alim, bir ziyalı, bir din adamı, bir millət vəkili, bir hökmdar və ya bir qəbilə rəisi ... Kim bu səlahiyyəti onlardan hər-hansı birinə versə, onu Allahdan başqa bir rəbb edinmiş olar.*
- *Bu səlahiyyəti Allahdan başqasına verən şəxs, etdiklərinin ibadət və Allahdan başqasını rəbb edinmək olduğunu bilməsə də, nəticə dəyişməz. Çünki cəhalət şirkin özürü yox səbəbidir.*
- *Bir varlığı rəbb və ya tanrı kimi qəbul etmək üçün: "Bu mənim rəbbimdir." Və ya: "Bu mənim tanrımdır." deməyə ehtiyac yoxdur. Rəbbin və tanrının xüsusiyyətlərini bir varlığa verdiyinizdə və ya bir varlığa Allaha edilməsi lazım olanları etdikdə, o sizin rəbbiniz / tanrınız olmuş olar.*

## 2 əl-Bəqərə

256. Dində məcburiyyət yoxdur. Artıq doğru yol azğınlıqdan aydın fərqlənir. Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm qulpdan yapışmış olar. Allah Eşidəndir, Biləndir.

*İslamın qopmaz qulpu Kəlimeyi Tevhiddir (Lə iləhə illə Allah). Birinin Kəlimeyi Tevhidin əhlindən olması və söylədiyi Lə iləhə illə Allah-ın özünə fayda verməsi üçün iki şərt zikr edilmişdir: Tağutu inkar və Allaha iman.*

*Tağut kəliməsi Qurani Kərimdə 8 fərqli ayədə zikr edilmişdir. Tağutu rədd etmək bütün peyğəmbərlərin ortaq dəvəti olmuşdur.*

*Qurana görə Tağut:*

- *Quranın ölçülərindən başqa ölçülər qoyaraq insanları vəhyin aydınlığından küfrün qaranlıqlarına aparan milli, dini və siyasi bilgi qaynağı. (2.Bəqərə, 257)*
- *Bütləşdirilmiş, uğruna yaşanılıb ölünən, dostluq və düşmənçiliyin özünə görə təyin edildiyi, Allahın razı olmadığı dəyərlər və izlənilən yollar (4.Nisa, 76)*
- *Allahın qanunlarına zidd qanunlar çıxaran və insanları buna dəvət edən şəxslər və qurduqları qanunlar (4.Nisa, 60)*
- *Allahdan başqa ibadət olunan, Allah kimi sevilən, qorxulan və ürəkdən itaət edilən canlı və cansız varlıqlar (39.Zumər, 17).*

*Allaha iman gətirdiyini iddia edən və tağutu rədd etməyən hər kəs tağuta iman edir, qulu olur və Allahı inkar edir.*

## 42. əş-Şura

21. Yoxsa onların Allahın dində izin vermədiyi şeyləri onlar üçün şəriət qanunu edən şəriklərimi var? Əgər (əzablarının Qiyamət gününə ertələnəcəyinə dair) həlledici Söz olmasaydı,

haqlarındakı iş bitmiş olardı. Həqiqətən, zalımları ağrılı-acılı bir əzab gözləyir.

*Allahın icazə vermədiyi şeyləri şəriət halına salan, haram-halal, qadağan-icazəli şəklində qanunlaşdıranlar, insanların Allaha şərik qoşduğu ortaqlardır. Çünki qanun qoymaq, şəriət qəbul etmək Allahın ən açıq sifətlərindəndir.*

## 11. Hud

87. Onlar dedilər: "Ey Şueyb! Atalarımızın ibadət etdikləri məbudlardan, yaxud mallarımızı istədiyimiz kimi istifadə etməkdən vaz keçməyimizi sənə namazınmı əmr edir? Doğrudan da, sən yumşaq xasiyyətli, ağıllı-başlı bir adamsan".

*Müşriklər Allaha inanmaqla bərabər* ***sekulyar*** *(din və dövlət işlərinin bir-birindən ayrı olduğuna inanmaq) olduqları üçün Allahın dünya işlərinə qarışmasını istəməzlər. Adət-ənənənin necə olacağına, mallarını hansı yolla qazanıb necə xərcləyəcəklərinə özlərinin qərar verməsini istəyərlər. Onlar birjaya, bank işlərinə və iqtisadiyyata müdaxilə edən Allaha xor baxarlar. Müşriklərə görə ibadətlər yalnız insanla Rəbbi arasında olan tamamilə vicdani bir mövzudur. İbadətlər ictimai sahəyə daşınmamalı, insanların həyatına qarışmamalı, sosial həyatda həlledici mövqedə olmamalıdır.* ***Peyğəmbərlərin dəvəti*** *isə Allahın (cc) göylərin və yerin sahibi olması, mütləq hakimiyyətin Allaha (cc) aid olması və Allahın (cc) həyatın hər sahəsinə qanunları ilə müdaxilə etməsi prinsipinə əsaslanır. (6.əl-Ənam, 3)*

*Müşriklərin, tevhid dəvətçilərinə İslam əxlaqını xatırlatmaları da diqqət çəkicidir. Onlara görə yumşaq xasiyyətli və yetkin olmaq heç bir işə qarışmamaq, haqqa şahidlik etməmək və cəmiyyəti işlədikləri günahlara görə xəbərdar etməməkdir. Bunları edən biri isə müşriklərin gözündə kobud, sərt, radikal və dində aşırıya gedəndir.*

*Allahın (c.c.) şahidliyi ilə peyğəmbərlər gözəl əxlaqlı, mülayim xasiyyətli, yetkin insanlardır. Bu, onlara şirkə şirk, müşrikə müşrik deməyə, günahların iyrənc olduğunu bildirməyə, cəmiyyətə yaxşılığı əmr edib onları pislikdən çəkindirməyə mane olmamışdır.*

## 4. ən-Nisa

60. Sənə nazil edilənə və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmədinmi? Onlar mühakimə olunmaları üçün tağuta müraciət etmək istəyirlər. Halbuki onlara tağuta inanmamaq əmr olunmuşdur. Şeytan isə onları dərin bir azğınlığa salmaq istəyir.
61. Onlara: "Allahın nazil etdiyinə və Elçisinə tərəf gəlin!"– deyildikdə, münafiqlərin səndən nifrətlə üz çevirdiklərini görürsən.

*Allahın şəriətini bir kənara buraxıb bəşəri qanunlara, adət-ənənəyə görə aralarında çıxan ixtilafı həll etmək istəyən şəxslər, inandıqlarını iddia etsələr də onların imanı gerçək olmayıb zənndən ibarətdir.*

## 5. əl-Maidə

44. Şübhəsiz ki, Tövratı Biz nazil etmişik. Onda hidayət və nur vardır. Allaha təslim olan peyğəmbərlər yəhudilər üçün

bununla, din xadimləri və baş keşişlər isə Allahın Kitabından qorunub saxlanılanlarla hökm verirdilər. Onlar hamısı buna şahid oldular. İnsanlardan qorxmayın, Məndən qorxun! Ayələrimi ucuz qiymətə satmayın. Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir.

*Allahın (c.c.) nazil etdiyi kitablara imanın tələbi olaraq, hakim vəzifələrdə olan şəxslər və insanlara yol göstərən alimlər bütün məsələlərdə Kitabla (Qurandakı qanunlarla) hökm verməlidirlər. Kitabla hökm etməmək küfr olduğundan Allah (c.c.) kitabla hökm etməyən insanların kafir olduğunu demişdir.*

*İndiki insanlar nəinki Kitabın bəzi müddəalarından əl çəkmişlər, onlar Kitabın hamısını tərk etmişlər və Allahın hökmlərini Allahın yaratdığı insanlar tərəfindən yazılmış qanunlarla əvəz etmişlər. Təkcə küfrə girmədilər, həm də Allahın sifəti olan qanun qoyma salahiyyətini özlərində görərək tağutlaşmışdırlar.*

## 4. ən-Nisa

76. Möminlər Allah yolunda, kafirlər isə tağut yolunda vuruşurlar. Elə isə şeytanın dostları ilə vuruşun! Şübhəsiz ki, şeytanın hiyləsi zəifdir.

*Allahın dininin (İslamın) uca olmasından başqa bütün ideologiyalar (demokratiya, millətçilik, torpaq və s.) üçün döyüşmək insanın kafir olmasına səbəb olar. Tək istisna insanın ailəsini, özünü, malını və s. qorumaq üçün döyüşməsidir. Hal-hazırda dövlətlərdə mövcud olan ordular Allahın dininin uca olmasına xidmət etmək üçün*

*qurulmayıb, əksinə insanların bütləşdirdiyi digər dəyərlərin qorunması üçün yaradılıb. Çünki yer üzündə haqq islam dövləti heç yerdə yoxdu və bütün mövcud ölkələr insanların icad etdiyi küfr qanunlarıyla idarə olunurlar. Hətta özlərini şəriət dövləti adlandıranlar belə Allahın qanunlarını bir çox mövzuda heçə sayırlar. Və orduları da batil ideologiyaları qorumağa xidmət edir. Ona görə də özünü müsəlman adlandıran şəxslərə bu ordularda əsgərlik etmək, batil ideologiyalar uğruna savaşmaq kafir olmaq üçün yetərlidir.*

## 39. əz-Zumər

17. Tağuta ibadət etməkdən çəkinib Allaha üz tutanlara müjdə vardır. Qullarımı müjdələ!

**Yuxarıdakı ayələr göstərir ki, qanun qoyma, halal-haram təyin etmə salahiyyəti yalnız Allaha aiddir. Bu salahiyyəti özündə görən tağut, bu salahiyyəti başqasına verən də müşrik olmuş olar. Bu ayələrə əsasən deyə bilərik ki, indiki prezidentlər, qanun qəbul edən millət vəkilləri, məhkəmələrdə hökm verən hakimlər tağut, sistemi qoruyan polis və əsgərlər tağutun ordusudur. Prezident və parlament seçkilərində iştirak edənlər də Allahın qanun qoyma sifətini tağutlara verən müşriklərdir. Bir adam tağutu inkar etmədən heç vaxt müsəlman ola bilməz. Əgər cəhənnəmdən qurtulub cənnətə girmək istəyiriksə tağutu inkar etməli, sistemdən və tağutlardan uzaq durmalı, heç kəsi qanun qoyma məsələsində Allaha şərik qoşmalı deyilik.**

# Sevgidə Allaha şirk qoşmaqla əlaqəli ayə

## 2. əl-Bəqərə

165. İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini Ona tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha şiddətlidir. O zalım olanlar əzabı gördükləri zaman bütün qüdrət və qüvvətin Allaha məxsus olduğunu və Allahın şiddətli əzab verən olduğunu görəcəklər.

*Birinin hər hansı bir şeyi Allahı (cc) sevdiyi kimi və ya Allahdan (cc) daha çox sevməsi, bağışlanmaz günah olan şirkin növlərindəndir. Bu şey istər insan olsun, istər büt olsun, istər bayraq olsun, istər vətən olsun, istər futbol komandası olsun, istər hər hansı bir ideologiya olsun, nəticə dəyişməz. İstənilən bir şeyi Allahdan çox sevmək, ona Allahdan çox dəyər vermək insanı müşriklərdən edər. Müşriklərin qiyamət günü yaşayacaqları peşmanlıqlarının biri də saleh insanları, onların ruhlarını və onları təmsil edən bütləri/məqbərələri/qəbirləri sevgidə, qorxuda, fayda və zərər vermədə Allaha (c.c) bərabər tutmalarıdır. (26. əş-Şuəra, 96-98; 71. Nuh, 23)*

# Şirk edənin heç vaxt özürlü olmadığını göstərən ayələr

**7. əl-Əraf**

172. Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış və: "Mən sizin Rəbbiniz deyiləmmi?"– deyə onları özlərinin əleyhinə şahid tutmuşdu. Onlar: "Bəli, biz şahid olduq!"– demişdilər. Bu ona görədir ki, siz Qiyamət günü: "Biz bundan xəbərsiz idik!"– deməyəsiniz.
173. Yaxud: "Atalarımız bizdən əvvəl Allaha şərik qoşmuş, biz də onlardan sonra gələn bir nəsil olmuşuq. Məgər Sən bizi batilə uyanların etdikləri əməllərə görə məhv edəcəksən?"– deməyəsiniz.

*Ruhlar aləmində insanlardan alınan bu söz, sözlərin ən vacibi və ən dəyərlisi olan tevhid sözüdür. İnsan yaradıcı, ruzi verən, mülk sahibi, kainatın işlərini idarə edən və qoyduğu qanunlarla insanları tərbiyə edən bir Rəbb olaraq Allahı tanıyacağına və heç bir varlığa bu salahiyyətləri verməyəcəyinə dair söz vermişdir. Ayədə tevhid sözünün alınma səbəbi olaraq iki şey zikr edilmişdir:*

*Birincisi "mən cahil idim", "xəbərsiz idim", "eşitmədim", "bilmirdim". bəhanələrini aradan qaldırmaq. Çünki Allah (cc) insandan yalnız söz almamış, həm də onu tevhid fitrəti üzrə yaratmışdır. (30.Rûm, 30) Bundan əlavə, kainat Allahın varlığına və birliyinə işarə edən çoxlu əlamətlərlə əhatə olunmuşdur (2.Bəqərə, 163-164). Bütün bunlara əlavə olaraq elçilər göndərildi və insanları tevhidə dəvət etdilər. (4.Nisa, 165) Bütün bu dəlillərə əsasən cəhalət yaradılışın məqsədi olan tevhiddə özür deyil.*

*İkincisi: “Mən atama, müəllimimə, şeyximə və liderimə tabe oldum və onları təqlid etdim.” kimi şəxsin bəhanələrini aradan qaldırmaq.*

**4. ən-Nisa**

165. Biz müjdə verən və qorxudan elçilər göndərdik ki, insanların elçilərdən sonra Allaha qarşı (“bilmədik, eşitmədik” kimi) bir bəhanəsi olmasın. Allah Qüdrətlidir, Müdrikdir.

# Şirk və küfr edənlərin kafir olduğuna inanmadan bir adamın müsəlman ola bilməyəcəyini göstərən ayələr

**3. Ali-İmran**

64. De: "Ey Kitab əhli! Bizim və sizin aranızda olan eyni bir kəlməyə gəlin ki, Allahdan başqasına ibadət etməyək, Ona heç bir şeyi şərik qoşmayaq və Allahı qoyub bir-birimizi ilahiləşdirməyək". Əgər onlar üz döndərsələr, deyin: "Şahid olun ki, biz müsəlmanlarıq!"

*Kitab əhlinin (xristian və yahudilərin) dəvət edildiyi ortaq kəlimə tevhid kəliməsidir. Adəmdən (ə.s.) Muhəmmədə (s.ə.s) kimi bütün peyğəmbərlər insanları Lə İləhə İllə Allaha dəvət etmişlər.*

*Ayə, bütün peyğəmbərlərin dini olan İslamın hansı əsillər üzərinə inşa edildiyini göstərən ən əhatəli ayədir.*

*1-ci əsil: Yalnız Allaha (c.c.) ibadət etmək: Dua, nəzir, qurban, namaz, təvəkkül, qorxu, sevgi, ümid kimi zahiri və batini bütün ibadətlərin yalnız Allaha (c.c.) edilməsidir.*

*2-ci əsil: Heç bir şeyi Allaha ortaq qoşmamaq: Bu ifadə birinci əsli qüvvətləndirmək və heç bir qapalılığa yer buraxmamaq üçündür. Allaha (c.c) aid hər hansı bir sifəti Allahdan (c.c) başqa varlıqlara verməmək və Allaha (c.c) olunmalı hər hansı bir ibadəti Ondan basqa varlıqlara etməməkdir. Quranda zikr edilən bəzi şirk növləri bunlardır: Allahdan başqasına dua etmək (qəbirlərə, ağaclara, ölülərə yalvarmaq və s.) (13.ər-Rad 13,14; 46.əl-Əhqaf 5,6); Allahdan başqasının qanun qoyma salahiyyətinə sahib olduğuna inanmaq və ya bu salahiyyəti bir başqasına vermək (prezident seçkiləri, parlament seçkiləri və s.) (9. Tövbə 31; 12.Yusuf 40; 18.Kəhf 26; 42.Şura 21); bəzi varlıqları Allahı sevən kimi sevmək (2.Bəqərə 165).*

*3-cü əsil: Allahı (c.c.) buraxıb başqalarını rəb qəbul etməmək: Rəb; tərbiyə edən, tənzimləyən, idarə edəndir. Yəni, insanların həyatında nizam-intizam yaradan, qoyduğu qanunlarla cəmiyyəti idarə edən hakim qüvvədir. Yəhudi və xristianlar din adamları barəsində həddi aşıb onlara halal və haramları təyin etmə salahiyyəti verdiklərinə görə Allah (c.c.) Tövbə surəsinin 31-ci ayətini endirdi. Bu salahiyyəti din adamlarına verməklə onları Rəb olaraq qəbul etdiklərini bildirdi. (Onlar Allahın icazə verdiklərini qadağan, qadağan etdiklərini də*

*icazəli etmişdilər...) Qanun qoyma, halal-haram təyin etmə salahiyyətini alimə, parlamentə, prezidentə verən onu Rəb olaraq qəbul etmiş olar.*

*4-cü əsil: Dəvətdən üz çevirənlərə "Şahid olun ki, biz müsəlmanlarıq." demək: Allah (c.c.) tərəfindən təyin olunan bu əsillərdən hər hansısa birini qəbul etməyənlərə və ya müxalifət edənlərə qarşı İslam kimliyini ortaya qoymaq, üz çevirənlərin isə müsəlman olmayıb kafirlərdən olduğuna inanmaq.*

## 60. əl-Mumtəhənə

4. İbrahim və onunla birlikdə olanlarda sizin üçün gözəl bir nümunə vardır. Onlar öz qövmünə dedilər: "Həqiqətən, biz sizdən və sizin Allahdan başqa tapındığınız şeylərdən uzağıq. Biz sizi inkar edirik. Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda daim ədavət və nifrət olacaqdır!" Yalnız İbrahimin öz atasına: "Mən sənin üçün mütləq bağışlanma diləyəcəyəm. Fəqət Allahdan sənə gələn əzabı dəf edə bilmərəm!"– deməsi istisnadır. Onlar dedilər: "Ey Rəbbimiz! Biz yalnız Sənə təvəkkül edir və yalnız Sənə üz tuturuq. Dönüş də yalnız Sənədir.

*Bu ayə, hər müsəlmanın izləməyə məcbur olduğu (16.Nəhl 123), üz çevirənin səfeh sayıldığı (2.Bəqərə 130), yolların ən gözəli olan İbrahimin yolunu və millətini izah edir. İbrahimin yolu:*

a. *Müşriklərdən bəri olmaqdır. Çünki şirki var edən, onu yaşadan müşriklərdir.*

*b. Allahdan başqa ibadət etdikləri bütlərdən və tağutlardan bəri olmaqdır. "Bəri olmaq" o şirki etməmək və şirki edənə qarşı şüurlu şəkildə öz münasibətini ortaya qoymaqdır.*
*c. Şirk əhlini saymamaq, rədd etmək və onların kafir olduğuna etiqad etməkdir.*
*d. Yalnız Allaha xalis olaraq ibadət etməklə, şərik qoşmadan, tək Allaha iman gətirənə qədər kafirlərə qarşı düşmənçilik və nifrət bəsləməkdir.*

*Bu, Allaha və Onun Elçisinə qarşı müharibə aparan, cəhənnəmin qapılarında oturan, bizim kimi danışaraq bizim kimi görünən ancaq camaatı aldadan, Qurandan danışan amma onun ayələrini cüzi qiymətə satanların böyük bir səylə gizləməyə çalışdıqları İbrahimin yolu və millətidir.*

## 109. əl-Kəfirun

1. De: "Ey kafirlər!
2. Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm,
3. siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz.
4. Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm,
5. siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz.
6. Sizin dininiz sizə, mənim dinim də mənədir!"

*Allah rəsulu (s.ə.s) bu surəni "şirkdən bəraət / şirkdən uzaq olma" surəsi kimi adlandırmışdır (Tirmizi 3403). Məlumdur ki, şirki tərk edib ondan tövbə etmədən bir adam müsəlman ola bilməz(3. Əli İmran 64, 9. Tövbə 11). Allah rəsulunun (s.ə.s) sözünü əsas alaraq deyə bilərik ki, şirkdən bəri olmaq ancaq aşağıdakı şərtlər ödəndikdə mümkün olar:*

a. *Allaha (c.c) şərik qoşan müşriklərin kafir olduğuna etiqad etmək.*
b. *Müşriklərin ibadət etdiyi tağutlara və bütlərə ibadət etməmək və onlardan bəri olmaq.*
c. *Allaha (c.c.) ibadət etdiklərini iddia etsələr belə, şirklə bərabər heç bir ibadətin keçərli olmadığına və şərik qoşanın əslində Allaha (c.c.) ibadət etməmiş olduğuna inanmaq.*
d. *Şirkin bir din olduğuna inanmaq, o dindən və o dinə tabe olanlardan bəri olmaq (uzaq olmaq).*

## 27. ən-Nəml

45. Andolsun ki Biz, "Allaha ibadət edin." deyə (dəvət etməsi üçün) Səmud tayfasına qardaşları Salehi elçi olaraq göndərdik. (Dəvət başladığı anda) Bir-birilərinə düşmən olan iki qrupa bölündülər.

*Tevhid dəvəti şirkin qarşısına çıxdığı anda aralarında düşmənçilik yaranır. Bu düşmənçilik, dəvətçinin ya da müşriklərin sərt-yumşaq, mədəni-mədəniyyətsiz, anlayışlı-kobud olması ilə bağlı deyildir. Haqq və batilin təbiətlərində olan ziddlik və uyğunsuzluq səbəbiylədir.*

**Son olaraq onu deyə bilərik ki, bir adam müsəlman ola bilmək üçün şirkin hər növündən uzaq durmalı, tağutu və əhlini inkar etməli, demokratiya, sosyalizm və s. Allahın şəriətinə zidd olan ideologiyaların küfr ideologiyalar olduğuna inanmalı, İslamdan başqa bütün dinlərin küfr olduğuna etiqad etməli və bütün şirk və küfür edənlərin o hal üzrə ölsələr əbədi cəhənnəmlik olduğuna inanmalıdır.**

**Aləmlərin Rəbbi olan Allaha həmd olsun.**